**AZƏRBAYCAN AŞIQLAR BİRLİYİ**

# Ozan dünyası №3(14), 2013

***Millətimi saz anladar, saz anlar,***
***Saza baxsın tariximi yazanlar.***

***Zəlimxan Yaqub***
***Xalq şairi***



**Ünvan:** Bakı, Zərifə Əliyeva küç. 53
**Əlaqə telefonları:**
( + 994 12) 493 86 61
(+994 50) 345 36 52
musa58@bk.ru

# PREZİDENT İLHAM ƏLİYEV GƏDƏBƏY AŞIQ MUSİQİSİ MƏKTƏBİNİN AÇILIŞINDA İŞTİRAK EDİB

**İlham Əliyev:** "*Aşıq sənəti bizim milli sərvətimizdir, milli sənətimizdir.*"



Azərbaycan Respublikasının Prezidenti **İlham Əliyev** sentyabrın 10-da Gədəbəy Aşıq Musiqisi Məktəbinin açılışında iştirak etmişdir.

Dövlətimizin başçısı əvvəlcə rayon ictimaiyyətinin nümayəndələri ilə görüşdü.

Azərbaycan Prezidentini Gədəbəy aşıqları öz ifaları ilə salamladılar.

Aşıq İsfəndiyar cənab Prezidentə müraciətlə "Xoş gəlmisən" – dedi. Sonra əlavə etdi: "Bu saz müqəddəs olduğuna görə mən bu sazı Gədəbəy aşıqları adından Sizə bağışlayıram".

Dövlətimizin başçısına Gədəbəy aşıqları adından saz hədiyyə olundu.

**Prezident İlham Əliyev**: Çox sağ olun. Təşəkkür edirəm.

Sonra Aşıq **İsfəndiyar Rüstəmov** bu binanın tikilməsi üçün sərəncam vermiş Azərbaycan Prezidentinə səmimi-qəlbdən dərin təşəkkürünü bildirdi. “Bizim Gədəbəy artıq dəyişib. Şəhərə oxşayır. Bulaqlar, sular çəkilir, körpülər tikilir” – dedi. Bütün bunlara görə dövlət başçısına minnətdarlığını bildirdi.



Prezidenti İlham Əliyev Gədəbəy rayon ictimaiyyətinin nümayəndələri qarşısında çıxış edərək dedi:

– Çox sağ olun. Şadam ki, yenidən görüşürük. Bax, bu məktəbin açılışında bərabər toplaşmışıq. Xatırlayırsınızsa, bu məktəbin təməl daşını biz bərabər qoyduq.

Çox şadam ki, artıq gözəl, göz oxşayan bir məktəb tikilmişdir. Bu məktəbin tikintisi o deməkdir ki, aşıq sənəti yaşayır və yaşayacaqdır.

Əlbəttə ki, məktəbdə oxuyan şagirdlər, uşaqlar, gənclər bu sənəti gərək yaşatsınlar. Sizdən nümunə götürüb bu sənəti yaşatsınlar. Çünki aşıq sənəti bizim milli sərvətimizdir, milli sənətimizdir. Azərbaycanda aşıq sənətinin çox dərin kökləri vardır. Azərbaycan aşıq sənətinin vətənidir. Əlbəttə ki, sizin kimi istedadlı aşıqların fəaliyyəti, sizin əməyiniz gələcək nəsillər üçün də örnək olmalıdır. Çünki gənc nəsil vətənpərvərlik ruhunda və milli ruhda tərbiyə almalıdır. Həmişə gənclərlə görüşlər

zamanı bunu qeyd edirəm ki, gənclər bilikli, Vətənə bağlı olmalıdır, vətənpərvər və milli ruhda böyüməlidirlər. Milli ruh da aşıq sənətidir. Milli ruh bizim musiqimizdir, muğam sənətidir, ədəbiyyatımızdır, xalçaçılıq sənətidir. Azərbaycanın bu sənəti bizim böyük sərvətimizdir, dünyanın sərvətidir.



Xalçaçılıq sənəti – onun vətəni Azərbaycandır. Aşıq sənətinin vətəni Azərbaycandır. Muğamın vətəni Azərbaycandır. Azərbaycan xalqı çox istedadlı xalqdır. Bu sənəti siz yaşadırsınız və gənc nəsillərə əmanət edirsiniz. Ona görə, bu məktəbin tikintisi çox böyük məna daşıyır. Təsadüfi deyil, mən ikinci dəfə burada olarkən məsələ qaldırıldı ki, belə məktəbin tikintisinə ehtiyac vardır. Məktəbin təməl daşını bərabər qoyduq. Bu gün isə məktəbin açılışında bərabər iştirak edirik. Yəni Azərbaycan dövləti gücləndikcə əlbəttə ki, məktəblərin tikintisi, musiqimiz, mədəniyyətimizin inkişafı ilə bağlı daha da ciddi addımlar atılacaqdır. Çünki, bu bizim gələcəyimizdir. Azərbaycan dövləti güclü, müasir dövlətdir. O dövlətdir ki, milli köklər üzərində qurulubdur. Ulu öndər Heydər Əliyevin dünyagörüşü bundan ibarətdir ki, müasir Azərbaycan dövlətçiliyinin əsasları ancaq milli mənəvi dəyərlər üzərində qurulmalı idi və quruldu da.

Belə olan halda xalqımızın gələcəyi çox parlaq olacaqdır. Çünki bizim dövlətçiliyimizin əsasları milli əsaslardır. Bu gün bizim ideoloji əsaslarımız milli əsaslar, milli dəyərlər üzərində qurulubdur. Bu dəyərlər arasında bizim musiqimiz, ədəbiyyatımız, aşıq sənətimiz xüsusi yer tutur. Aşıq sənəti sadəcə olaraq xalq yaradıcılığı deyildir. Bu, Azərbaycan

xalqının ürəyində yaşayan çox böyük dəyərdir. Siz də dəyərli insanlarsınız ki, bu sənəti yaşadırsınız. Ölkəmizin hər bir yerində milli musiqi, ədəbiyyat inkişaf edir. Bizim musiqimiz çox gözəldir və dünya miqyasında tanınır. Ədəbiyyatımız, kitablarımız, tarixi abidələrimiz – bizim dövlətimiz nə qədər zəngindir, xalqımız nə qədər istedadlıdır! Bütün bunlar xalqımızın istedadının məhsuludur. Ona görə, bu gün təkcə Gədəbəy üçün deyil, ölkəmiz üçün əlamətdardır. Çünki gözəl, yaraşıqlı məktəb açılır və bu məktəbdə oxuyacaq uşaqlar, gənclər bu sənəti yaşadacaqlar.



Gədəbəy rayonunda olarkən, bir məsələni vurğulamaq istəyirəm ki, hər yerdə olduğu kimi burada da inkişaf gedir, quruculuq vardır, abadlıq işləri aparılır. Mən xatırlayıram ki, bir küçə tamamilə başqa görkəmdə idi. İndi binalar bərpa edilir, küçələr salınır. Bu gün buraya gələrkən körpünün açılışında iştirak etmişəm. Kənd yolu çəkilir. Təqdimatda göstərildiyi kimi, heç vaxt yol olmayan yerlərdə 56 km uzunluğunda kənd yolları tikilir. Torpaq yol olmuşdur, insanlar əziyyət çəkirdilər. İndi kənd yolu çəkilir. İçməli su layihəsi icra ediləcəkdir. Biz mütləq Gədəbəy şəhərini təmiz içməli su ilə təmin edəcəyik. Hesab edirəm ki, gələn ilin sonuna qədər bu layihənin əsas hissəsi başa çatmalıdır. Bir müddət bundan əvvəl kəndlərə qazın verilməsi başlamışdır. Onu da qeyd etməliyəm ki, bir qədər ləng gedir. Daha da sürətlə getməlidir ki, əksər kəndlər qazlaşdırılsın. Məktəblər, binalar tikilsin. Şəmkir-Gədəbəy yolu yaxşı vəziyyətdədir, rahat yoldur. Növbəti illərdə yeni kənd yolunun tikintisi də

nəzərdə tutulub. Bu gün mənə bu məsələ təqdim olundu. Göstəriş veriləcəkdir ki, bütün kəndlərə gedən yollar yenidən qurulsun, Gədəbəy rayonu daha da sürətlə inkişaf etsin, burada insanlar daha da rahat, xoşbəxt, rifah, əmin-amanlıq içində yaşasınlar. Necə ki, bu gün bütün Azərbaycan vətəndaşları rifah, sülh, əmin-amanlıq içində yaşayırlar. Bizim inkişafımızın əsas səbəbi məhz budur. Sabitlik, əmin-amanlıq, cəmiyyətdə mövcud olan xoş əhval-ruhiyyə bu gün Azərbaycanı bir çox ölkələrdən fərqləndirən cəhətdir.

Sizi bir daha alqışlayıram, salamlayıram, aşıqlara öz dərin hörmətimi bildirmək istəyirəm, sizə cansağlığı və yeni yaradıcılıq uğurları arzulayıram.

Professor **Məhərrəm Qasımlı** Gədəbəyin inkişafına göstərdiyi diqqət və qayğıya görə dövlətimizin başçısına təşəkkür edərək dedi:

- Cənab Prezident, Gədəbəyimizə xoş gəlmisiniz. Biz bu gün çox böyük bir mədəni-tarixi hadisənin iştirakçısıyıq. Əlbəttə, belə bir möhtəşəm sarayın qurulması sözün həqiqi mənasında çox əzəmətli bir tarixi hadisədir. Bildiyimiz kimi, ozan-aşıq mədəniyyəti, bayaq siz də çox gözəl dediniz, bizim milli mənəvi varlığımızın əsas göstəricilərindən biridir. Ulu öndərimiz Heydər Əliyev ozan-aşıq mədəniyyətini milli varlığımızın mötəbər qaynağı olduğunu xüsusi qeyd etmişdir. Bu söz Dədə Qorqud ensiklopediyasında qızıl hərflərlə keçir.

Bu gün o ideya, o düşüncə bu sarayın simasında öz əyaniliyini bir daha tapır. Biz sizə təşəkkür edirik ki, sizin dövrünüzdə Azərbaycanın milli sərvətləri qeyri-maddi irs olaraq UNESCO səviyyəsində öz təsdiqini tapdı. Allah Mehriban xanımın canını sağ etsin ki, bu fədakarlığı çox səylə həyata keçirdi və doğrudan da, bu gün Azərbaycanımızda təkcə iqtisadi sahədə deyil, mədəni-mənəvi sahədə də çox böyük quruculuq işləri gedir. Bizim sazımız, sözümüz, muğamımız, xalça sənətimiz, Novruz bayramı ilə bağlı olan proseslər bunun hamısının ifadəsidir. Biz bəlkə də hadisələrin içərisində olduğumuz üçün bütün möhtəşəmliyini o qədər də görə bilmirik, amma kənardan gələnlər, xarici qonaqlarımız Azərbaycanı heyrət içərisində seyr edirlər. Bu, çox böyük uğurdur. Bu, sizin sayənizdə, sizin ulu öndər Heydər Əliyev siyasətini, onun strateji hədəflərə yönəlmiş siyasətini gerçəkləşdirməkdə əldə etdiyiniz uğurların nəticəsidir. Biz sizə çox təşəkkür edirik. İnşallah sazımız-sözümüz hər zaman sizinlə bir yerdə olacaqdır. Əlbəttə, ustadımızın da dediyi kimi, saz çox müqəddəs alətdir. Qoy sazın ruhu, sazı qoruyan ruh, ulu ozanların ruhu, hər zaman sizə yardımçı olsun, onun işığı, xeyiri, bərəkəti sizinlə bir yerdə olsun. Biz sizə dərin təşəkkür edirik ki, sazımıza, sözümüzə, aşıq sənətinə belə gözəl, əzəmətli sarayı bəxş etdiniz. İnanırıq ki, siz Bakımızda da

aşıqlar üçün belə gözəl saray tikdirəcəksiniz. Buna da şübhəmiz yoxdur. Çünki siz sazın, sözün, mənəviyyatımızın dostusunuz. Biz sizinlə fəxr edirik. Siz burada qeyd etdiniz ki, aşıq məktəbi gənclər üçündür, gələcəyimiz üçündür. Burada gənclərimiz dayanıblar. Sizin sözünüzə qüvvət olaraq indi onlar ifa edəcəklər. Siz gənclərin dostu olan bir Prezidentsiniz. O mənada gəncləri də dinləməyinizi xahiş edirik.

***

Sonra Prezident İlham Əliyev gənc aşıqların ifasını dinlədi.

***

Daha sonra xatirə şəkli çəkdirildi.

***

Prezident İlham Əliyev Gədəbəy Aşıq Musiqisi Məktəbinin rəmzi açılışını bildirən lenti kəsdi, burada yaradılan şəraitlə tanış oldu.

Bu musiqi ocağının təməli 2009-cu ildə Prezident İlham Əliyev tərəfindən qoyulmuşdur. Binanın həyətində Aşıq Ələsgərin heykəli ucaldılmışdır. Foyedə ulu öndər Heydər Əliyevin və Prezident İlham Əliyevin mədəniyyətin inkişafına və Gədəbəyə səfərlərini əks etdirən fotolardan ibarət guşə yaradılmışdır.

Bildirildi ki, bu ilin iyununda başa çatdırılan tikinti işləri çərçivəsində ikimərtəbəli binada bütün şərait yaradılmışdır. Musiqi məktəbində inşaat işləri "Lider Monolit" şirkəti tərəfindən həyata keçirilmişdir. Burada kitabxana və qiraət zalı yaradılmış, musiqi xəzinəsini özündə əks etdirən kitab və nəşrlərlə zənginləşdirilmişdir. Sahəsi 194 kvadratmetr olan 121 yerlik akt zalı, həmçinin səhnə zəruri avadanlıqla təchiz olunmuşdur. Burada səs yazma studiyası da qurulmuşdur. Məktəbdə köməkçi otaqlarla yanaşı, qrim otağı, yeməkxana da fəaliyyət göstərir. Sinif otaqlarında tədrisin yüksək səviyyədə aparılması üçün hər cür şərait vardır. Bu musiqi məktəbinin özəlliyini artıran mühüm amillər biri də burada aşıq musiqi sənəti ilə bağlı muzeyin yaradılmasıdır. Muzeydə Gədəbəy aşıqları, o cümlədən ölkəmizin tanınmış saz ustadları haqqında məlumatlar toplanmışdır. Bundan əlavə aşıq sənətinə dair müxtəlif eksponatların nümayiş etdirildiyi muzey zənginliyi ilə diqqəti cəlb edir. Hazırda rayonda 150-dən çox aşıq vardır. Binanın ikinci mərtəbəsində divarda Azərbaycanın tanınmış aşıqlarının fotoları, ulu öndər Heydər Əliyevin və Prezident İlham Əliyevin ölkəmizdə aşıq sənətini inkişafı ilə bağlı sərəncamlarını surətləri asılmışdır.

Dövlətimizin başçısı Aşıq Musiqisi Məktəbində yaradılmış şəraiti yüksək qiymətləndirdi.

# USTAD AŞIQ KAMANDAR ƏFƏNDİYEVİN DOĞMA KƏNDİNDƏ BÜSTÜ VƏ EV-MUZEYİ AÇILMIŞDIR




2013-cü il sentyabrın 18-də ustad aşıq **Kamandar Əfəndiyevin** Gürcüstan azərbaycanlılarının yığcam yaşadıqları Kvemo Kartli-Borçalı bölgəsinin Marneuli rayonundakı Kəpənəkçi kəndində büstünün və ev-muzeyinin açılış mərasimi keçirilmişdir.

Mərasimdə iştirak edən Gürcüstanın Mədəniyyət və Abidələrin Mühafizəsi naziri **Quram Odişariya** demişdir ki, ustad Aşıq Kamandarın büstünün və ev-muzeyinin açılışında iştirak etmək mənim üçün çox xoşdur. Nazir bildirmişdir ki, aşığın 80 illik yubileyini Tbilisi şəhərində təntənəli surətdə qeyd etdik və bu zaman ustadın xatirəsinə Gürcüstanda ilk dəfə Aşıqlar festivalı keçirilməsi təşəbbüsü meydana çıxdı. Hazırda həmin tədbirin gerçəkləşdirilməsi istiqamətində iş aparılır.

Q.Odişaria tezliklə aşığın ev-muzeyinə rəsmi status veriləcəyini də vurğulamış və əmin olduğunu bildirmişdir ki, Aşıq Kamandarın ev-muzeyi azərbaycanlılarla yanaşı, gürcülərin də sevimli ibadətgahına çevriləcəkdir.

O, Kəpənəkçiyə gələnədək Gürcüstanda sosial layihələrin həyata keçirilməsində də öndə olan Azərbaycan Respublikası Dövlət Neft Şirkətinin (ARDNŞ) dəstəyi ilə Marneuli şəhərində tikilib istifadəyə verilmiş möhtəşəm "Çay evi"nə baş çəkdiyini və burada ulu öndər Heydər Əliyevin "Azərbaycan və Gürcüstan dostluğu hamıya örnək olmalıdır, əgər dünyanın bütün xalqları, dövlətləri belə bir dostluğa nail ola bilsəydilər, heç yerdə, heç zaman müharibə baş verməzdi", – müdrik kəlamı ilə tanış olduğunu qeyd etmişdir. Nazir Aşıq Kamandarın ev-muzeyinin bu baxımdan da əsl dostluq, qardaşlıq, qarşılıqlı anlaşma, sülh məkanına çevriləcəyini bildirmişdir.

Folklorşünas **Məhəmmədəli Məşədiyev** bu günü mötəbər bir tarix adlandırmış və qeyd etmişdir ki, türk dünyasının azman sənətkarı Kamandar aşıq sənətində xüsusi dəst-xətti olan, məktəbləşmiş bir sənət-

kardır. Onun büstünün və ev-muzeyinin açılması ustadın böyük xidmətlərinə verilən qiymətin təzahürüdür və bu işin təşkilatçıları, təşəbbüskarları alqışa layiqdirlər.

Azərbaycan Aşıqlar Birliyinin katibi, "Ozan dünyası" jurnalının baş redaktoru **Musa Nəbioğlu** qeyd etmişdir ki, Aşıq Kamandar yalnız Borçalı aşıq məktəbinin deyil, bütövlükdə Azərbaycan aşıq sənətinin ən böyük nümayəndələrindən biridir. O demişdir ki, Aşıq Kamandar özündən sonra əbədiyaşar dəst-xətt qoyub getmiş böyük sənətkardır və onun bülbül avazı xatirələrdən heç vaxt silinməyəcəkdir.

Musa Nəbioğlu aşığın yubileyinin Azərbaycanda, həm də Gürcüstanda geniş qeyd edildiyini, barəsində kitablar çap olunduğunu bildirmiş, onun büstünün, ev-muzeyinin açılmasını təkcə Kamandar irsinə deyil, bütövlükdə Azərbaycan aşıq sənətinə verilən yüksək qiymət kimi dəyərləndirmiş, Gürcüstanın müvafiq qurumlarının Azərbaycan mədəniyyətinə, incəsənətinə göstərdikləri diqqəti Azərbaycan-Gürcüstan dostluğunun təzahürü kimi qiymətləndirmişdir. Azərbaycan Aşıqlar Birliyinin sədri, Xalq Şairi **Zəlimxan Yaqubun** böyük arzularından birinin gerçəkləşdiyini qeyd edən M.Nəbioğlu onun xoş arzularını iştirakçılara çatdırmışdır.

Gürcüstan Azərbaycanlıları Mədəniyyət Mərkəzinin rəhbəri **Fazil Həsənov** Aşıq Kamandarın xatirəsinin əbədiləşdirilməsi təklifinə dəstək verənlərə, ARDNŞ-in Gürcüstan nümayəndəliyinə təşəkkürünü bildirmiş və bu yönümdə nəzərdə tutulan tədbirlərdən söhbət açmışdır.

Aşıq Kamandarın övladı **Əflatun Əfəndiyev** ailəsi adından ustadın xatirəsini əziz tutanlara minnətdarlıq etmişdir.

Azərbaycan və gürcü ictimaiyyəti nümayəndələrinin qatıldıqları tədbir əsl el şənliyinə çevrilmiş, mərasim aşıqların gözəl ifaları ilə davam etdirilmişdir.

Tədbirdə Gürcüstanın Baş nazirinin milli məsələlər üzrə köməkçisi **Savalan Mirzəyev**, Gürcüstan parlamentinin deputatı **Azər Süleymanov**, ARDNŞ-in Gürcüstan nümayəndəliyinin məsul əməkdaşı **Taleh Qasımov,** Azərbaycan Respublikası Ağsaqqallar Şurasının üzvü **Akif Kərimov** və başqaları iştirak etmişlər.

***İslam Əliyev***

**AŞIQ ŞƏMŞİR - 120**

**Zəlimxan YAQUB**
**Xalq şairi**



# ZAMAN-ZAMAN OLDU BİZİM RUHUMUZA QİDA ŞƏMŞİR

Aşıq Şəmşir haqqında olduqca çox danışmaq olar. Mən bu böyük insanla, bu görkəmli sənətkarla çox oturub-durmuş, onunla ən səmimi şəkildə ünsiyyət qurmuşam. O, həm sənətkar, həm də bir insan kimi çox-çox yüksəkliklərdə dayanan el ozanı, Tanrı qüdrəti ilə ilhamlanan dahi şəxsiyyət idi. Təkcə onu söyləyə bilərəm ki, Dədə Şəmşir körpəliyində Aşıq Ələsgəri, cavanlığında Səməd Vurğunu görən, iki dahinin nəfəsindən ilham alan, Tanrının Azərbaycana hədiyyəsi, Kəlbəcərin, Dəlidağın, Qoşqarın, Kəpəzin, Ceyran bulağının, Taxtadüzün məcnunu, divanəsiydi. Aşıq Şəmşir həm sağlığında heykəlləşən, əbədiləşən, zaman-zaman yaşamaq hüququ qazanan böyük bir sənətkar – övliya, din adamı, Allah vergisi, həm də Tanrı payı alan, şair, yaradıcı ustad aşıqdır. Necə deyərlər:

*Hər ilahi gözəlliyə*
*Şux nəğmələr yazan olan,*
*Dədə Qorqud boylarında*
*Dönüb Salur Qazan olan,*
*Dilindəki haqqa dua,*
*Səsindəki əzan olan, –*

böyük bir sənətkar, xalq sevgisi, el məhəbbəti qazanmış böyük bir kişi, mürşidi-kamil, müdrik ustaddır, ruhumuzun qidasıdır. Yəni:

*Zaman-zaman oldu bizim ruhumuza qida Şəmşir,*
*"Cəngi"silə, "Misri"silə saldı elə səda Şəmşir,*
*Vurğununu zaman-zaman hey gətirdi yada Şəmşir,*
*Zaman keçdi, illər ötdü, axır oldu Dədə Şəmşir!*



Dədə Şəmşir təkcə Kəlbəcərin, Dəlidağın, Ceyran bulağının, sərt qayaların oğlu deyil, həm də sazımızın, sözümüzün, ruhumuzun, təfəkkürümüzün, yaddaşımızın oğludur. XX və XXI əsrlər tarixində yeganə adamdır ki, Səməd Vurğunla tarixi görüşündən sonra onun evi ocağa döndü, Aşıq Şəmşir Dədələşdi, Dədəyə çevrildi. Çox aşıqlar, çox sənətkarlar öz peşəsinin, öz işinin birincisidir, ustadıdır, ancaq öz işində, öz sənətində Dədəlik zirvəsinə qalxmaq – bu, artıq bəndəlik deyil, Allahın işidir. Dədəlik söhbətinin bəndəyə aidiyyəti yoxdur, Allah vergisidir. Ona görə ki, Dədə olan yerdə öyüd var, nəsihət var, ağsaqqallıq var, yanan ocaq var, nur var, sevgi-məhəbbət var, əhli-ürfan var, ağır oturub, batman gələn ərənlər var, həyat aləmi var. Aşıq sənətinə dədəlik eləmək zarafat deyil.

Bu sənətdə Dədə Qorqud, Dədə Qurbani, Dədə Abbas, Dədə Qasım, Dədə Ələsgər var və bu dədələrin cərgəsində XX əsrdə dədəliyi sağlığında qazanmaq ancaq Aşıq Şəmşirə qismət olmuşdur. Mən Allahın o xoşbəxt bəndələrindən biriyəm ki, Dədə Şəmşirlə söhbətlərimizdə çox şeyləri eşitmişəm, görmüşəm. O, Ələsgərə "Ələsgər əmi", Səməd Vurğuna "Səməd" deyirdi və Ələsgərlə bağlı nələri danışırdısa, onun hamısını Dədə Şəmşirin öz varlığında gördüm. O, ürəyiyumşaq, zərif, həssas, incə, kövrək, alicənab bir insan, ürəyi də, qapısı da, süfrəsi də hamıya açıq sənətkar idi. Ağdabanda öz əlilə tikdiyi evin arxasında Qurban bulağı vardı. Danışırdı ki, atası Qurban Aşıq Ələsgərlə bu bulağın başında məclis qurar, tarixlər yaradardı.

Dədə Şəmşirlə söhbət açmaq insanlaşmaq, mələkləşmək, durulaşmaq, peyğəmbərləşmək idi. Məhz aşıq sənətinin də, sazın da qarşısında bu müqəddəslik vardır. Ona görə Dədə Şəmşirin bütün yubileylərinin

hamısı xalq bayramına, el bayramına çevrilir. Çünki o, həqiqətdən mayalanıb. Mən onun ustadnamələrinin, qoşmalarının, gəraylılarının, təcnislərinin, dastanlarının bir çoxunu yaddaşımda yazmışam. Mən Zəlimxan özümə mənəvi ata və ağsaqqal saydığım böyük ustaddan o qədər gözəlliklər gördüm, onun könül qazanında o qədər qaynayıb bişdim ki, onu bir görüşə, bir məclisə, bir söhbətə yığıb-yığışdırmaq qeyri-mümkündür. O, alicənab bir kişiydi.

Günlərin bir günü Aşıq Şəmşiri ziyarət etmək üçün Kəlbəcərə getmişdim. Orada ustadla on gün qaldım, dağları seyr etdim, gəzdim, dolaşdım və sonra dedim ki, ustad, məni bağışla, getmək istəyirəm. O, dedi: "Bakıya balmı tökülüb, ay zalım oğlu? Ayə, bu dağın başını, sərin bulaqlarını qoyub hara gedirsən, qal".

Nə isə, onun sözünü yerə salmayıb daha üç gün də artıq qalıb Bakıya qayıtdım. Mən Kəlbəcərdən ayrılanda, doğrudan da, Dədə Şəmşir çox kövrəlmişdi. Çünki bir-birimizə isinişmişdik və həm də gözəl şeirlər yazmışdıq. Məni tanıyanlar, yaradıcılığıma bələd olanlar yaxşı bilirlər ki, yaradıcılığım da bir Dədə Şəmşir damarı da var. Və bu gün mən fəxr edirəm ki, bu gözəl insanı tanımışam, onunla dost olmuşam, onunla bir süfrədə çörək kəsmişəm. Onun əli mənim əlimi sıxıb, kürəyimdə gəzib. Bu əli kiçik vaxtlarında Aşıq Ələsgər, sonralar isə nurani vaxtında poeziyamızın ağsaçlı qartalı Səməd Vurğun və digər görkəmli insanlar sıxıblar. Özümü bu insanla təmasda olduğuma görə xoşbəxt sanıram.

Hə, mətləbdən ayrılmayaq, onu da nəzərinizə çatdırım ki, Kəlbəcərdən su kimi durulmuş, bal kimi şirinləşmiş, çiçək kimi açılmış, qar kimi təmizlənmiş, çəmən kimi yaşıllaşmış, göylər kimi genişlənib gəlmişdim Bakıya. İşlədiyim idarəyə daxil olanda gördüm ki, iki nəfər bir-birini qırır. Bir-birlərinə olmayan nalayiq sözlər deyirlər. İkiəlli vurdum başıma, dedim: vay, fələk sənin evini yıxsın, sənə o kişi dedi axı Bakıya balmı tökülüb, getmə, qal burda. Mən də qulaq asmayıb gəldim. İndi bax, burda biri ağsaqqal, o biri cavan, bir-birini elə qırırlar ki, Allah göstərməsin. Düşündüm ki, əgər ağsaqqallarımız özünü belə aparırsa, vay bu millətin halına. O zaman bu hadisə ilə bağlı iki şeir yazmışdım. Şeirlərdən biri belədir:

*Bilsəydim qanımı qaraldacaqlar,*
*Bilsəydim səbrimi daraldacaqlar,*
*Min dəfə qəlbimdə su bulandırıb,*
*Bir dəfə halımı duruldacaqlar,*
*Heç enib gəlməzdim o ucalıqdan.*

*Dağda dağ olardım, zirvədə qaya,*
*Qalxardım Günəşə, uçardım Aya,*
*Bilsəydim bu qədər yerdə günah var,*

*Göylərdən baxardım mən bu dünyaya,*
*Heç enib gəlməzdim o ucalıqdan.*

Bizi zaman-zaman göylərə çağıran, ucalığa səsləyən Dədə Şəmşirin goru nurla dolsun! Böyük şəxsiyyətilə, böyük sənətilə dədələrimizin cərgəsində dayanan, bizi də dədə görmək istəyən kişiyə bir daha eşq olsun!

Onunla bağlı bir hadisəni də xatırlatmaq istəyirəm. Bakıda ömrünün son günlərini yaşayırdı. Ağır xəstə idi. Qənbər müəllim də gəlməyinə üç-dörd gün ara vermişdi. Dədə Şəmşirdən çox nigaran idim, ona görə də getdim ziyarətinə. Gördüm çox kövrəkdi. Onu kövrəltmədən xeyli söhbət etdik. Evə qayıdanda Dədəyə bir şeir həsr elədim. Mürəkkəbi qurumamış həmin şeiri də götürüb sabah yanına getdim. Bir az əhval-pürsanlıq edəndən sonra dedim: ustad, dünən məni yaman kövrəltdin, odur ki, evdə dayana bilməyib bir şeir yazıb gətirmişəm. Şeirim rəhmətliyin çox xoşuna gəldi, sevindi, üzü nurlandı, bir az da gözəlləşdi. Onunla bir qədər söhbətləşdikdən sonra çıxıb getdim. Səhərisi günü yenə onun ziyarətinə gələndə mənimlə səmimi görüşüb dedi:

– Birdən elə bilərsən ki, daha Dədə Şəmşir qocalıb, söz deyə bilmir. Al sözünün cavabını:

*Güllü sözün nələr saldı yadıma,*
*Düşdü xəyalıma hara, Zəlimxan?*
*Ata övladına həsrət qalarmış,*
*Sənətkarı axtar, ara, Zəlimxan.*

*Sığallı tellərə nə lazım sığal,*
*Fəhmində fərasət, başında kamal,*
*Bir “Cəngi” oxuyum, eşit, ləzzət al,*
*Səs yayılsın o dağlara, Zəlimxan.*

*Fikir ver Şəmşirin çəkdiyi aha,*
*Söz ağır getməsin qadir Allaha,*
*Vurğunu çağırmaq çətindir daha,*
*Qövr edir sinəmdə yara, Zəlimxan.*

Məclislər bəzəyi, ellər yaraşığı, gözəllər sirdaşı, təbiət oğlu, şairlərin dostu Aşıq Şəmşir kövrəlmişdi. Çünki ömrünün sonuncu məqamına yaxınlaşmışdı. Amma həmin vaxtlar onda bir hikmət gördüm. Yəni indi 60-ı yaxaladığım bir vaxtda görürəm ki, Aşıq Şəmşirdə olan bu mənəvi ucalığa çox az adam çata bilər. Ömrünün ən axırıncı anlarında da “Güllü nənə” deyib, “Güllü nənə” eşidirdi. Ay Allah, onların arasında necə sevgi, necə məhəbbət, necə rəftar vardı, necə ülvilik mövcuddu. Onun gö-

zündə Güllü nənə ay parçası, mələk idi. Güllü nənə gül kimi o dağlarda açılardı. Onu da söyləyim ki, Güllü nənə çox xanım-xatın, ürəyiaçıq, qəlbiaçıq, süfrəsiaçıq, gülərüz, şirinsöz bir qadın idi. Təsadüfi deyil ki, Dədə Şəmşirin yaradıcılığında Güllü nənəyə həsr etdiyi şeirlər çoxdur. Onun şeirlərinin baş qəhrəmanı həmişə Güllü nənəydi. Azərbaycan aşıq şeirinin tarixində heç bir aşiqin ömür-gün yoldaşı Güllü nənə qədər Aşıq Şəmşir şeirindəki kimi sevgidən yarımayıb. Ruhları şad olsun!



Bir dəfə Kəlbəcərdən Bakıya gəlirdim, amma oralardan ayrılmaq istəmədiyimdən kədərliydim. Yolboyu köksüm sıxılırdı və dilimdən yavaş-yavaş aşağıdakı şeir süzülməyə başladı:

*Kəlbəcər dağları, salamat qalın,*
*Meylimi düzlərə salıb gedirəm.*
*Zirvələr önündə əyib başımı,*
*Dərin xəyallara dalıb gedirəm.*

*Dünya yarıtmadı məni payımdan,*
*Nə ilindən doydum, nə də ayından,*
*Ceyran bulağından, Tərtər çayından*
*Vurğunun ətrini alıb gedirəm.*

*Zəlimxan, alışıb yanmaqdır peşəm,*
*Gərək Fərhad olub qayalar deşəm,*
*Qurban ocağında közə dönmüşəm,*
*Şəmşirin sazını çalıb gedirəm.*

Nə olsun ki, gedirəm deyirdim, məgər getmək olurdu mu? Dədə Şəmşirdən, Kəlbəcərdən, dağlardan ayrılmaq olurdumu? Bu həmin dağlardır, həmin ucalıq, həmin möhtəşəmlikdir ki, ölümünə iki-üç gün qalmış dünyayla vidalaşanda Dədə Şəmşir demişdi:

*Səfalı, sarvanlı, aranlı, dağlı,*
*Mehriban ellərim, salamat qalın!*
*Obalarda xoş güzəran keçirdim,*
*Aylarım, illərim, salamat qalın!*

*Bu günümdə kaş olaydı yanımda,*
*Hüseynim, Tofiqim, Bəxtiyarım da.*
*Saz çalmağa taqət yoxdu canımda,*
*Titrəyən tellərim, salamat qalın!*

*Dədə köçür, ay Zəlimxan, gözləmə,*
*Sızlayan, gurlayan dastan gözləmə,*
*Vaxt ötüşdü, Məmməd Aslan, gözləmə,*
*Quruyub sellərim, salamat qalın!*

*Mən gəzdiyim Qarabağ var, Gəncə var,*
*Ruhu kövrək, çiçəkləri incə var,*
*Sinəm üstə əcəl adlı pəncə var,*
*Ay şirin dillərim, salamat qalın!*

*Şairlər ordusu, aşıqlar dəsti,*
*Siz yazın, yaradın, deməyin bəsdi,*
*Şəmşirin bağında bir tufan əsdi,*
*Soluxdu güllərim, salamat qalın!*

Dədə Şəmşir bu dünya ilə vidalaşanda da elə ustad kimi ustadnamələrilə vidalaşdı. Ancaq bu vidalaşma cismani vidalaşma idi. Mənəvi cəhətdən Dədə Şəmşir adında bir varlıq heç vaxt, heç zaman heç yerdə heç kəslə vidalaşmayacaq. Çünki o, Allah dərgahındadır.

Ulu öndərimiz Heydər Əliyev də Dədə Şəmşirin yaradıcılığını yüksək qiymətləndirib dəfələrlə onunla bağlı sərəncamlar imzalamışdı. Dədə Şəmşir xoşbəxt adam olub ki, siyasətin zirvəsi hesab olunan Heydər Əliyev və poeziyamızın zirvəsi sayılan Səməd Vurğunla şəxsi tanışlığı olub. Onlar sağlıqlarında həmişə qəlbən bir yerdə olublar və yəqin ki, indi Allahın dərgahında da bir yerdədirlər. Bu üçlük bir yerdədirsə, dünya Dədə Şəmşirlədir. Bu üçlük bir yerdədirsə, xalq millətlədir, millət dövlətlədir.

Eşq olsun Aşıq Şəmşirin Dədəliyinə, müdrikliyinə, damarında axan qana, uyuduğu müqəddəs torpağa ki, XX əsr və gələcək bizə – Azərbaycan xalqına Dədə Şəmşir kimi bir şəxsiyyət bəxş edib! Bu gün Aşıq Şəmşirin Yeddiqardaş dağında uyuyan müqəddəs ruhu nigarandır. Onun ruhu kafər tapdağında inləyir. Yadıma onun məzarının başında Güllü nənəylə qol-qola dayanıb durduğum anlar düşdü. Həmin vaxt onun məzarı üstündə mən bu sözləri demişdim:

*Həyatda yadigar qoyub getdiyin,*
*İzəm, nişanəyəm, ləpirəm, ustad.*
*Həmişə əlindən öpərdim sənin,*
*İndi torpağından öpürəm, ustad.*

Bizim nigarançılığımız indi ondan ibarətdir ki, dünən əlindən öpdüyümüz ustadın bu gün uyuduğu torpağından öpə bilmirik. Ancaq məndə zərrə qədər şübhə yoxdur ki, Aşıq Şəmşirin ruhumuzu oxşayan o zil səsi bizi yenidən həmin müqəddəs yerlərə qaytaracaq, yenidən Kəlbəcər kəlbəcərlilərin olacaq, Azərbaycanın olacaq.

*Ən böyük, ən şirin arzularını*
*Yoğurmaq istəyir, yapmaq istəyir.*
*İtmiş Kəlbəcəri kəlbəcərlilər*
*Şəmşirin sazında tapmaq istəyir.*

Ona görə də Yeddi qardaş dağının zirvəsində uyuyan Dədə Şəmşirin və ondan xeyli aralıda Dədə Şəmşirin ruhundan nigaran qalan Güllü nənənin müqəddəs ruhunu şad etmək üçün Azərbaycan öz sazı ilə, ruhuyla, qeyrətilə, dədəliyilə silahlanmalıdır. Çünki vətən bizimdir, Ceyran bulağı bizimdir, İstisu bizimdir, itirilmiş torpaqlarımızın hamısı bizimdir, Azərbaycanın, Dədə Şəmşirindir.

Bu gün Aşıq Şəmşirin Kəlbəcəri də bənövşə kimi boynu bükükdür. Şeirində Aşıq Şəmşir bənövşənin boynunu düz görmək istəyirdi. Təsəvvür etmək olmur ki, Aşıq Şəmşirin Kəlbəcəri indi işğal olunmuş bir ərazidir. Amma işğal olunmamış bir ərazi də vardır ki, bu da Aşıq Şəmşir poeziyasıdır. Bu, Aşıq Şəmşirin şeiriyyətidir ki, onu bizim ruhumuzdan almağa heç bir kütlənin gücü çatmaz. Şimşək də, ildırım da zəiflərin qənimidir, güclülərə heç nə edə bilmir. Heç bir tufan, heç bir qasırğa sözün sehrini yıxa bilməz, sözün böyüklüyünü yıxa bilməz.

*Buz azalı,*
*Bu Gəncəm, bu Zazalı.*
*Necəsən, bir ah çəkəm,*
*Dağlar da buz azalı.*

Ola bilər sabah tarixdə Zazalı adında kənd olmasın, amma bu bayatının hesabına o, tarixdə zaman-zaman yaşayacaq.

Dədə Şəmşirin yaşadığı Ağdaban kəndi də şəhid oldu. Bircə bu faktı söyləyim ki, 50 ev 40 nəfər şəhid verdi.

Aşıq Şəmşirin əlyazmaları, kitabları şəhid oldu. Nə qədər doğmaları, əzizləri şəhid oldu. Gör Kəlbəcər nə kökə düşdü!

Sonda bir arzumu bildirmək istəyirəm. Güllü nənə bu dünyadan köçəndə vəsiyyət edib demişdi: "Tabutumu dəmirdən edin ki, sabah Kəlbəcər alınanda mənim cənazəmi yerdən qaldırmaq üçün əziyyət çəkməyəsiniz".

O gün olsun ki, bütün işğal olunmuş torpaqlarımız özümüzə qayıtsın və o zaman biz də Güllü nənənin tabutunu Yeddiqardaş dağının başında Dədə Şəmşirlə yanaşı dəfn edək. Onların ruhunu rahat etməyi Allah bizlərə qismət eləsin.

Kim sazın aşiqidir, kim əhli-ürfan dünyasının adamıdır, kim Dədə Şəmşirin övladıdır, kim saz sənətinin xəstəsidirsə, o, gözəl bilir ki, Aşıq Şəmşir elə bir iz qoyub gedib ki, bunu sözlə ifadə etmək çətindir. Nəsillər dolanacaq, aylar-illər keçəcək, zaman zamanı, fəsil fəsli, nəsil nəsli əvəz edəcək, dünyaya təzə oğullar gələcək, analar yeni şairlər doğacaq, ancaq Aşıq Şəmşir ucalığı, Aşıq Şəmşir böyüklüyü öz mərtəbəsində qalacaq və bütün nəsillər əlində şam-çıraq Dədə Şəmşirin tərbiyəsindən mayalanmaq üçün yenidən o ağsaqqala, onun poeziyasına, sənətinə müraciət edəcək, onu axtaracaq. Ancaq onu tapmaq o qədər də çətin olmayacaq. Çünki Dədə Şəmşir özünün yerini, harada olduğunu açıq-aydın hamıya bildirir:

*Şəmşiri axtarıb görmək istəsən,*
*Verdiyin ilqara gəl vədəsində!*

Deməli, Aşıq Şəmşiri görmək istəyən hər kəs paklaşmalı, təmizlənməli, durulmalı, saflaşmalı, çirkin işlərdən uzaq olmalı və verdiyi ilqara əməl etməlidir. Bu keyfiyyətləri özündə ehtiva edənlər isə hər zaman onu görə biləcəklər. Bax, Dədə Şəmşir də şeirində bunu demək istəmişdir.

Eşq olsun Dədə Şəmşiri Azərbaycan xalqına bəxş edən Allahın qüdrətinə! Eşq olsun Azərbaycan xalqına! Eşq olsun köklü-budaqlı nəsil şəcərəsinə ki, bu gün Aşıq Şəmşir dinimizin dühası kimi yaddaşımızdadır.



**Savalan FƏRƏCOV**

# *BÖYÜK MƏHƏBBƏT ABİDƏMİZ: "AŞIQ QƏRİB" DASTANI*

Xalqımızın aşıq yaradıcılığında özünəməxsus yeri olan məhəbbət abidələri var. Ustad sənətkarlar tərəfindən zaman-zaman yeni-yeni variantlarda çalınıb-oxunan həmin əsərlərdən biri də "Aşıq Qərib" dastanıdır.

"Aşıq Qərib" dastanı barədə yazılı məlumat XIX əsrin 20-ci illərinə təsadüf edib. Mənbələrdə göstərilir ki, dastan ilk dəfə (rəsmi məclisdə) 1813-cü ildə İran-Rusiya arasında "Gülüstan" müqaviləsinin bağlandığı vaxt oxunub. Belə ki, Qarabağın Gülüstan kəndində bağlanan faciəvi sazişin şərəfinə bir ziyafət təşkil edilir. Məclisdə "Qəriblə Şahsənəmin hekayəti" dastan şəklində söylənilir. Bu barədə o vaxtkı Azərbaycan mətbuatında heç bir məlumat dərc edilməyib... Ancaq sazişin imzalanma mərasimində A.Lazeryev adlı bir hərbi müşavir iştirak edib. O, çox sonra – yəni 1825-ci ildə rus ədəbi məcmuələrinin birində bir yazı dərc etdirib. Göstərib ki, "Gülüstanda imzalanan sazişlə bağlı İran diplomatları tərəfindən təşkil edilən bir məclis quruldu. Orada Nüsrəddin adlı bir sənətkar sazda çox məharətlə çalıb-oxudu. Onun ifa etdiyi "Qəriblə Şahsənəmin hekayəti" bütün məclisdəkiləri heyran etdi. Həmin an ürəyimdən belə bir istək keçdi: Kaş çarizmin Qafqaza islaha göndərdiyi rus yaradıcılarından biri imperiyanı sarsıtmağa çağıran ideyalardan əl çəkib, belə təsirli rəvayətləri qələmə alıb bizlərin ruhunu oxşayaydı".

Bu rəvayət barədə A.Lazeryevin təfərrüatlı məlumatı Qafqazda sürgün həyatı yaşayan rus şairi M.Y.Lermontova da məlum olur. O, həmin məlumatın izinə düşür. "Aşıq Qərib" dastanını söyləyən aşıqlardan biri ilə tanış olur. Hekayəni dinləyib və süjeti əsasında eyniadlı məşhur poemasını yazıb. Bu faktı təsdiqləyən başqa bir məlumat isə poema ilə

aşıq söyləmələri arasındakı süjet yaxınlığı, mövzu və məzmun oxşarlığıdır. Süjetin sonrakı illərdə başqa bir variantı, yenə Azərbaycan aşıqlarından M.Mahmudbəyov tərəfindən yazıya alınıb. 1882-ci ildə SMOMPK – "Qafqaz əraziləri və xalqlarının təsviri üçün materiallar toplusu"nda dərc edilib. Daha sonra 1916-cı ildən etibarən məlum "Orucov qardaşları mətbəəsi"ndə litoqrafiya üsulu ilə dastan Azərbaycan və türk dillərində bir neçə dəfə nəşr edilib. Həmin nəşrlərin öz məzmun dolğunluğu və sənətkarlıq baxımından Gəncə variantı daha çox dinlənilib-qəbul edilib. Dastan Azərbaycan və Anadoluda geniş şöhrət tapıb və yayılıb. Təsadüfi deyil ki, həmin variant əsasında Anadolu aşıqları onun Anadolu variantını formalaşdırıb. 1930-cu ildən etibarən Azərbaycanda dastan bir çox aşıqlar tərəfindən qələmə alınıb. Nəticə olaraq bir neçə variantı Ə.Tahirov, Ə.Axundov və başqaları tərəfindən çap edilib.

Araşdırmalardan məlum olur ki, dastanın Azərbaycanda on, Anadoluda yeddi variantı qeydə alınıb. Hər iki versiya və variantlar barədə kifayət qədər tədqiqat işləri aparılıb. Hələ xeyli əvvəl dastan haqqında akademik H.Araslı, professorlardan M.H.Təhmasib, P.Əfəndiyev, A.Nəbiyev və başqaları dəyərli tədqiqat işləri aparıblar. Akademik H.Araslı və filologiya üzrə fəlsəfə doktoru S.Yaqubovaya görə Aşıq Qərib tarixi şəxsiyyət olub. XVI əsrdə yaşayıb-yaradıb və Təbriz aşıq məktəbinin görkəmli sənətçilərindən olub

Doğrudan da, "Aşıq Qərib" milli dastan yaradıcılığının ən erkən süjetlərini əhatə etdiyi kimi, xalqımızın erkən orta əsr məişət həyatını, adət-ənənələrini və cəmiyyətdaxili ziddiyyətlərini geniş şəkildə özündə ehtiva edib. Sözsüz ki, bu əsər, qeyri-maddi mədəni dəyərlərimizin böyük şifahi abidəsidir. Dastanda Qəribin öz toyuna gəlib çıxmasını ustad aşıqlarımız xalqımıza məxsus mükəmməl bədii detallar, motivlər və süjetlərlə dövrünün tipik əhvalını özündə əks etdirən obrazlarla təqdim edib. Onların hər hansı başqa bir xalqa məxsus olduğunu iddia etmək, onları saxtalaşdırıb özünküləşdirmək heç cür mümkün deyildir. Bu özünəməxsusluğun süjetdəki bir neçə aydın görüntüsünü xatırlatmaq və onları milli dəyərlərimizə göz dikənlərin diqqətinə catdırmaq çox yaxşı olardı.

"Aşıq Qərib" dastanının süjeti Azərbaycan aşıq yaradıcılığında yeni məhəbbət dastanı kimi buta arxasınca getmə ənənəsi üzərində qurulub. Söz yox ki, bu ənənə daha çox islam baxışları-görüşləri ilə bağlıdır. Yəni aşiq və məşuqun yuxuda bir-birinə buta edilməsi, biri-birindən xəbərsiz olaraq ilahi varlıq tərəfindən bəxş edilən nikah bağlantısı, ilahi vergisi ilə bağlıdır. Azərbaycan dastan yaradıcılığında bu tipli süjetlərdə aşiq və məşuqlar bir çox çətinliklərlə üzləşsələr də, sonda bir-birinə qovuşa

bilirlər. Məlumdur ki, bu adət xalqımızın yaxın və uzaq qonşularına ötürmədiyi dastan yaradıcılığı metodu və ənənəsidir.

Eyni zamanda bu tipli süjetlərdə butalanan qəhrəmanlara dara düşərkən kömək edən qüvvələr: Xızır, Həzrət Cəbrayıl və s. islam anlamı ilə bağlı fövqəlbəşər qüvvələr olub. Bu da ancaq və ancaq müsəlman ehkamçılığına məxsusdur. Çünki bütün bunların dastanda özünəməxsus ümumi süjet xətti ilə möhkəm vəhdəti mövcuddur. Onları saxtalaşdırıb dəyişdirəndə, özününküləşdirəndə anlaşmazlıqlar və təhriflər meydana çıxır.

Məlumdur ki, "Aşıq Qərib" dastanında əhvalat sadə bir süjet üzərində qurulub: Tacir Məhəmmədin Rəsul, Heydər adlı iki oğlu və bir qızı olur. O, bir gün arvadını çağırıb vəsiyyət edir. Bildirir ki, varlı yerdən oğlanlarına qız alma. Qızını da varlı yerə ərə vermə… O, vəsiyyətini tamam edib gözlərini əbədi yumur. Elə bu vaxt İsfahan lotuları gəlib Məhəmmədin yas mərasiminə çıxırlar. Özlərini sövdəgarın dostu kimi qələmə verirlər, Rəsulla qumar oynayır, bütün var-yoxunu əlindən alır və gecə ikən aradan çıxırlar. Rəsul bir papaqçıya şəyird dayanır… Bir gün ziyarət üçün atasının qəbri üstə gedir. Qəbrin üstündə çox ağlayır və orada da yuxuya gedir… Yuxuda ikən Tiflisli Xoca Sənanın qızı Şahsənəm ona buta verilir. Rəsul öz butasının arxasınca getməli olur. Başqa məhəbbət dastanlarında olduğundan fərqli olaraq Rəsul anasını, bacısını və kiçik qardaşı Heydəri də özü ilə götürür. Gəlib Tiflisə çatır və bir qarıya rast olur. Qarı vəziyyətdən hali olur. Ona görə də deyir: siz qalın burada, mən gedim Şahsənəmi muştuluqlayım. Elə buradaca qarı Rəsulu "Qərib" deyə çağırır və Rəsula "Aşıq Qərib" adı xoş gəlir. O, bu adı özünə götürür. Bir gün keçir, səhəri Tiflis meydanında özünə kirayə ev axtarmağa çıxır. Kirayə ev tapa bilməyən Aşıq Qərib anası, bacısı və Heydəri məscidin həyətində qoyub Xoca Əhməd adlı karvanbaşının yanına gedir. Amma Xoca ona yer vermir. Rəsul bir qəhvəxanaya girir. Burada o, Güloğlan adlı bir aşıqla deyişir və onu məğlub edir. Aşıq Qərib burada Təbrizdən butasının arxasınca gəldiyini, düşdüyü vəziyyəti əvvəlcə sözlə, sonra da sazla söyləyir. Hadisələr açılır, Şahsənəm Aşıq Qəribin gəlişindən xəbər tutur və onunla görüşür. Ancaq Qərib Şahsənəmin əmisi oğlu Şahvələdə nişanlı olduğunu bilir. Bu xəbər onu sarsıdır. Şahsənəm əmisi oğluna xəbər göndərir ki, məni yeddi il gözləsin…

Vədə tamamında məclisə gələn Aşıq Qərib əvvəlcə qəbul olunmur. Ancaq o, uzaq yolu Xızırın köməyilə başa vurduğunu, dəlil kimi atının ayağının altından götürdüyü torpağı anasının gözünə çəkməklə onun gözünün açılması Aşıq Qəribə olan etimadı artırır. Bütün bu epizodlar dünya eposunda ənənəvi süjetlərin sıra düzümü çərçivəsində davam edir. Onlarda nəzərə çarpan xüsusiyyətləri Şahsənəmin Qəribi görməsi və onu

tanımasından sonra konflikt açılmağa doğru inkişaf edir. Bütün həqiqətlərin üzə çıxmasında Aşıq Qəriblə Şahsənəmin bir-birini tanıması süjetin əsas mərhələsinin başlanmasına səbəb olur. Aşıq Qərib Şahsənəmə qovuşmaq üçün bütün əzablara dözür. Dastanda Qəribin keşməkeşli həyatının çox gərgin bir mərhələsi təsvir olunur. Bu, çətinlik və ağır güzarandan çıxma, buta arxasınca getmə, böyük çətinliklərə qalib gəlib toy gününə qovuşma, həm də yeni həyata çıxma ilə əlamətdardır. Dastanın əvvəlində butasına qovuşacağına nagüman olan Rəsul dastanın sonunda artıq muradına yetişən haqq aşığı kimi diqqəti çəkir...

Ənənəvi süjetlər əsasında yaranan dastanlarda dünyəvi süjetlər hadisələrin əsasında dayansa da, aşıqlar onları milli həyata məxsus bədii boyalar, rənglərlə cilalayır, müxtəlif adət-ənənə və deyimlərlə zənginləşdirərək məhəbbət dastanlarının yeni bir tipi kimi xalqın mədəni abidəsi edirlər. Elə buna görə də “Aşıq Qərib” tarixi bir dövr ərzində milli repertuarı bəzəyib, onun müxtəlif versiya və variantları yaranıbdır. “Aşıq Qərib”in librettosu əsasında Ü.Hacıbəyov (1915) “Aşıq Qərib”, C.Cabbarlının librettosu əsasında görkəmli rus bəstəkarı Qliyer “Şahsənəm” operalarını yazıb...

“Aşıq Qərib” dastan yaradıcılığının şah süjetlərindən biri kimi yüzillikləri aşıb gələrək özünü milli yaddaşa bu şəkildə əbədi olaraq həkk edib. Çünki “Aşıq Qərib” əsəri xalqımızın dastan yaradıcılığı silsiləsində özünə əbədiyaşar bir yer tutan şifahi düşüncə dəyəridir.



**İlyas TAPDIQ**
***Şair, Prezident təqaüdçüsü***

## *XUDU SAZI*

...Saz haqqında söhbətlər həmişə könlümə ən çox yatan söhbət olub. Ünlü ustad aşıqlar haqqında eldə-obada, dastanlarda, rəvayətlərdə olan söhbətləri də əsasən ustadların dilindən eşidirdim. Göyçəli aşıq Çopur Şükürün söhbətləri daha çox Aşıq Alıdan, Ələsgərdən, Məmmədhüseyndən olurdu. Morullu aşıq Teymurun söhbətləri Badadan, ustad Misaqdan, Borçalı aşıqları Əmrah və Hüseyn Saraçlının söhbətləri Dərəçiçəkli aşıq Alıdan, Çıldırlı aşıq Şennikdən, Ağacandan, Aşıq Səməddən, şair Nəbidən, Aşıq Məhəmmədəlidən (o həm də durnaboğazlı saz ustası olub) çox maraqlı əhvalatlar eşitmişəm.

Doğulub böyüdüyüm Alnavatın ustaları Azaflı İslamın, Yetim Usufun töləki və cökə ağacından düzəltdikləri sazların içi oyma olardı. Bəzi yerlərdə iriyarpaqlı töləki və cökə ağacı qapı və pəncərələr üçün də yaxşı sığal götürən, rəndədən çıxanda par-par parıldayan ağac materialı kimi öyülürdü.

Bəli, bütün bu söhbətlər uşaqlıq illərindən başlayaraq indiki yaşıma qədər eşitdiklərimin bir hissəsi olub. Bu söhbətlərin içində Səməd Vurğundan, Osman Sarıvəllidən, Aşıq Mirzə Bayramovdan, Usta Xududan eşitdiklərim də heç zaman yadımdan çıxmır...

Hüseyn Bozalqanlı, Aşıq Nəcəf, şair Həsən (Mülkülü), Aşıq Əsəd, Aşıq Mirzə Bayramov, İmran, Əkbər, balabançı Abbas, Mikayıl Azaflı, Çopur Ələsgər, Aşıq Aydın sazı danışdırar, sözə sığal çəkərdilər: Cökəli, Bahar bulağı üstündə sazlı, balabanlı gur məclislər könül oxşayardı. “Xudu sazları” köynəkdən çıxanda dağların yamacları toy-bayram donu geyinərdi. Telman Tovuzlunun

*Ey Vətən, mən sənin gözəlliyini,*
*Hər zaman başımın tacı bilmişəm.*

*Oğlunu özümə vəfalı qardaş,*
*Qızını mehriban bacı bilmişəm.*

– şeirinin sədaları ilə Xudu sazları qanadlanardı.
Osman qağa saz haqqında "Gətir, oğlum, gətir" şeirində yazmışdı:

*Onda "Kərəmi" var, onda "Cəngi" var,*
*Hər simdə bir əsrin öz ahəngi var...*
*Aşıq sədəflərdə büzdükcə simi,*
*Məclis dalğalanır bir dəniz kimi...*



Bəli, bu gün də məclisləri dalğalandıran telli sazdan, onun ustalarından şirin söhbətlər düşür. İndi hansı aşığı danışdırsan, Tovuzun Məşədilər kəndində yaşamış, Yanıqlı kəndində "saz bağı" salmış Usta Xududan söhbət sala bilər. Sazın necə ərsəyə gəlməsindən, qabırğasından, qolundan, çanağından, xərəyindən, simlərindən, sinə taxtasından, bəzək şirmayısından, aşıqlarından... danışar.

Usta Xudu dostcanlı, qonaqpərvər, "əli qızıl kəsən" bir usta idi. O, gördüyü işi çox səliqə-sahmanla görürdü. Cökənin, tutun, qozqara ağacının, simlərin seçmələrini tapanda çox sevinirdi. Saz üçün lazım olan ağacın əsasən ən qocamanını tapırdı, düyünlü ağacdan istifadə etmirdi.

Müəyyən müddətdə onları rəndəylə, kərkiylə, "Mərdəli baltısı"yla düzənə salırdı, törpüləyirdi; incə işləri gördükcə kobudlaşan, lakin yorulmaq bilməyən əlləri ilə saz düzəldirdi. Onun düzəltdiyi sazlar həmişə saz olurdu. Məclislərdə adla-sanla aşıqlar əlində dövrana çıxırdı. Aşıqdan soruşsan: – "bu hansı ustanın əlindən çıxıb?" – bircə iftixarlı cavabı vardı: "Xudu sazıdır!"

Çox təəssüf, gözəl insan, gözəl usta bu gün sıramızda yoxdur. Lakin sənəti ilə həmişəlik özünə rəhmət oxudur.

Onun üç oğul yadigarı: Arif, Fərman və Aydın Xudu adıyla fəxr edir, Xudunun ustalığından geri qalmayan sazları sənət aləminə gələn yeni-yeni sazlı-sözlü insanlara çatdırır.

İlk ustadı Adəmdən başlayan saz, sözümüzlə yanaşı addımlayır, yüzillərin səsini bu günə, bu günün səsini gələcəyə aparır.

*"Mirzəcanı", "Gözəlləmə",*
*Qılınc çalır dərdə, qəmə.*
*Yanıq Kərəm enir bəmə,*
*Onda Əsli sevdası var!*

*Saz dinəndə məclis yatmaz,*
*"Cəngi"sinə cəngi çatmaz.*
*Qalxanına qılınc batmaz,*
*Koroğlunun sədası var.*

*Sazı öyrən, sözü öyrən,*
*Ey İlyasın gözü, öyrən..!*
*Saz üstündə bizi öyrən,*
*Sazda ana laylası var!*

*15.05.2013*





**Təranə VAHİD**

# QOCA DÜNYANIN HÜSEYN CAVANI



***Həyatı boyu Azərbaycanın güneyi ilə quzeyi arasında mənəvi körpü salmağa çalışan Hüseyn Cavan Azərbaycan aşıq ədəbiyyatının həmişəcavan, barlı-bərəkətli budaqlarından biridir.***

*Aşıq nə gözəl yazdı,*
*Mirzələr gözəl yazdı,*
*Qumru kimi danışan*
*Sinəmdə telli sazdı.*

– deyən Hüseyn Cavan 1916-cı ildə Cənubi Azərbaycanın Kərmədüz mahalının Uti kəndində yoxsul bir ailədə anadan olub. Erkən yaşlarında atası Mikayıl kişi qəfil dünyasını dəyişir, anası Zöhrə maddi-mənəvi ehtiyaclara tab gətirə bilmədiyindən oğlu və üç qızı ilə birlikdə Arazın şimal səmtinə pənah gətirir, Goranboy rayonunun Dəlməmmədli kəndində məskunlaşır.

Allah bəndəsini darda qoymaz. Xeyirxah bir əlin vasitəsilə könülləri sevindirər. Belə bir sevinc yeniyetmə Hüseynə də qismət olur. Məskunlaşdıqları ərazidə xeyirxah əməllər, niyyətlər sahibi Məşədi Adıgözəl avazındakı şirinliyi, səsindəki qeyri-adiliyi eşidib günlərin birində onu qədim Göyçə mahalına – ozan-aşıq sənətinin qüdrətli istedad sahibi Dədə Ələsgərin qardaşı oğlu Musanın yanına aparır. Adıgözəl kişi: “Aşıq, bu uşaq həsrətindən göynədiyimiz Təbriz elindəndir. Naəlaclıqdan biz tərəfə

gəliblər. Olduqca dadlı-duzlu səsi var. Onun həsrətli avazını eşidəndə, vallah, kövrəlirəm. Buna görə də yanınıza gətirmişəm ki, sənətin incəliyindən onu bir az da agah edəsiniz", – deyir.

Hüseyn bu müqəddəs ocaqda saz çalmağı, söz qoşmağı daha mükəmməl öyrənməyə başlayır. Çox keçmir ki, nəyə qadir olduğu üzə çıxır, ustadı ilə birgə el məclislərində ad-san qazanır.

### *Dərdi saza danışarlar*

Sazda ifa etdiyi ”Yanıq Kərəmi”, “Dilqəmi”, “Baş sarıtel” havacatları dinləyicilərin böyük marağına səbəb olur, Hüseyn Cavan ürəyindəki sözləri sinəsindəki telli saza pıçıldayır.

O, 1934-cü ildən şeir yazmağa başlayır. “Gül, Azərbaycan”, “Oyan, vətəndaşım, oyan”, “Ana vətən” kimi şeirləri Arazın o tayında, Təbrizdə “Vətən yolu” qəzetində dərc olunur, dillər əzbəri olur.

Tale yenidən Hüseyn Cavanın üzünə gülür: 1938-ci ildə həsrətini çəkdiyi Təbrizə qayıdır. Onu alqışlarla qarşılayırlar. Təxminən səkkiz il orada yaşayır. Milli-demokratik hərəkat təlatümə gəldiyi zaman sazı və sözü ilə fədailəri qələbəyə ruhlandırır. Ona inananları, dinləyicilərini tərəqqiyə səsləyir. 1945-ci ildə Cənubi Azərbaycanda milli hökumət qurulur. El məhəbbəti qazanmış haqq aşığı xalq qarşısında xidmətlərinə görə “21 Azər” medalı ilə təltif olunur.

*Kərəm gəzdi lələsiylə Əslini,*
*Axtarmadı nəcəbini, əslini;*
*Axır tapdı gözəllərin əslini,*
*Aşiq odur, yana-yana can desin!*

1946-cı ilin martında Təbrizdə Dövlət Dram Teatrı təşkil olunur, Hüseyn Cavan burada direktor müavini vəzifəsində çalışır, inqilabi ruhlu nəğmələri ilə çıxış edir. Teatrda aşıqlar ansamblı yaradır.

### *Həsrət, işıq və məhəbbət*

Ürəyi Vətən həsrəti, qəlbi məhəbbətlə, işıqla dolu olan Hüseyn Cavanın yaradıcılığında məhəbbət şeirlərinin də öz yeri var. Bu illərdə o, ən gözəl şeirlərini qələmə alır.

*Sevgilim, sən maral kimi*
*Gəzməyi kimdən öyrəndin?*

*Ay qabağa cığa teli*
*Düzməyi kimdən öyrəndin?*

Bu gün də çoxları bilmir ki, dillər əzbəri olan, məclislər bəzəyən "Kimdən öyrəndin?" şeirinin müəllifi Hüseyn Cavandır.

*Mən sevirəm Zərnişanı,*
*Onda var gülün nişanı,*
*Sağ əlinlə bənövşəni*
*Üzməyi kimdən öyrəndin?*

1946-cı ildə Cənubi Azərbaycanda milli hökumət süqut edir. Tale onu yenidən Arazın bu tayına gətirir. M.Maqomayev adına Azərbaycan Dövlət Filarmoniyasında solist kimi fəaliyyət göstərir. Böyük səhnədə çıxışı hərarətlə qarşılanır. Respublika özfəaliyyət incəsənət festivalının laureatı olur, birinci dərəcəli diplom alır. 1953-cü ildə "Şərəf nişanı" ordeni təltif olunur, daha sonra Əməkdar incəsənət xadimi fəxri adına layiq görülür. 12 dastanı dillər əzbəri olan aşığın 9 kitabı işıq üzü görür.

*Azad bir qız girib bağa,*
*Gəzir boylana-boylana.*
*Xumar gözün sola-sağa*
*Süzür boylana-boylana.*

Güney və Quzey Azərbaycanda səsi, sazı-sözü ilə dolaşan Hüseyn Cavan 1985-ci il noyabrın 14-də 69 yaşında dünyasını dəyişir. Goranboy rayonunda torpağa tapşırılır. Məzarı üstündəki abidə üzü doğma yurda – Təbriz səmtinə ucaldılıb...

O, hələ 20 yaşında "Təbriz" şeirində yazırdı:

*Sarılıb boynuna bir körpə sayaq,*
*Doyunca hüsnünə baxaydım, Təbriz!*
*Sən bir dağ olaydın, mən də bir bulaq,*
*Şırhaşır sinəndən axaydım, Təbriz!*

Hələ o zamanlar unudulmaz şair Süleyman Rüstəm bu qoşmanı oxuyub Hüseyn Cavana məktub yazmışdı.

### *Qaraçıoğlu Aşıq Paşanın dedikləri*

Aylar-illər ötüb keçsə də, ustad sənətkar sevgiylə, məhəbbətlə yad edilir, saysız-hesabsız şəyirdləri onun sənətini layiqincə yaşadırlar.

Qaraçıoğlu Aşıq Paşa Mehdiyevdən bir gün xəbər alırlar ki, ay ustad, kimə qulluq eləmisən? Gözləri yaşarır, yadına ustadı Hüseyn Cavan düşür. Babası Aşıq İbrahimi xatırlayır. Deyir ki, babam Qaraçıoğlu Aşıq İbrahim 103 yaşında idi. Bir gün dedim, ay baba, sazı mənə də öyrət, yaman həvəsim vardı: "Qaraçıoğlu Aşıq İbrahim dedi ki, mənim yaşım az deyil, qocalmışam, daha o gücüm yoxdu. Get, gör, aşıq Hüseyn Cavan səni özünə şəyird götürərmi? Götürsə, ondan öyrən, zəmanənin Ələsgəridi. Babamın məsləhəti ilə Hüseyn Cavanı tapdım. O gündən düz 13 il ona qulluq elədim. Çəkməsinə qədər təmizlədim. Əvəzində isə sazı-sənəti öyrəndim. Bu da ən böyük qazancımdı. Ustadım məni toylara da aparırdı, sonra halallığın aldım".

Hüseyn Cavandan bizə bir qatar bayatılar da miras qalıb.

*Aşığam, elçi məni,*
*Gözlədir elçi məni.*
*Öz sevdiyim bir qıza*
*Göndərin elçi məni.*

Hüseyn Cavanın yaradıcılığı haqqında məqalələr, kitablar yazılıb. Belə toplulardan biri də ustadın şərəfinə özünə "Cavan" təxəllüsü götürmüş Adil Cavana məxsusdur. Onun "Azadlıq pərvanəsi" bədii-publisistik kitabına ön söz yazan tanınmış qələm sahibi, Əməkdar jurnalist Əhməd İsayevin fikirlərindən: "...Adil gözünü açandan evlərində, ocaqlarının başında ürəyi nisgilli Aşıq Hüseyn Cavanı görüb, onun sazını, sözünü eşidib. Bu ünsiyyətin bəhrəsi olaraq Adil Cavan həyatdan narahat, nigaran gedən Hüseyn Cavan haqqında müxtəlif xatirələri toplayıb oxuculara çatdırıb".

...Ozan-aşıq sənətimizin layiqli davamçılarından olan Hüseyn Cavan qədirbilən, sənətsevər insanlar tərəfindən dönə-dönə xatırlanır. Mərhum sənətkar taleyindən küsüb-barışsa da, məramı, məqsədi bir olub: Azərbaycanı daim uca görmək.

Hüseyn Cavan dünyasına boylanan hər kəs onun dürlü-dürlü sözlərini, dərya-dərya fikirlərini, arzularını, diləklərini eşidər. Biz də bir dastan ömrü yaşayan aşığın könül dəftərini vərəqlədik. Ruhu şad olsun!

**AŞIQ ƏMİR - 90**



**Əlixan YƏHYAOĞLU**

# UNUDULMAZ SƏNƏTKAR

Əgər yaşasaydı, indi ömrünün 90-cı yubiley baharını yaşayar və böyük təmtəraqla bu yubileyi özü də qeyd edərdi. Təəssüf ki, taleyinə yazılan amansız ölüm Aşıq Əmirin ömür karvanının sarvanı oldu və arzularını yarımçıq qoydu. Bu gün üçün möhlət vermədi. Aşığın "saydığını fələk saymadı" və daha bir sənətkar ömrünü, insan həyatını ürəyimizin dərinliklərində əbədi xatirəyə çevirdi.

Aşıq Əmir 1923-cü ildə Borçalıda – indiki Bolnisi rayonunun Sarallar kəndində dünyaya göz açmışdı. Muxtar kişi gözünün ilki olan oğlu Əmiri həmişə yanında gəzdirər, el şənliklərinə, toy məclislərinə aparardı.

**HAŞİYƏ:** Bir dəfə anası Qızyetərlə bazara gedən balaca Əmir mağazada oyuncaq çalğı alətini görüb onu alması üçün ağlayır. Anası satdığı malların pulu ilə oğlunun istəyini yerinə yetirir. O gündən balaca Əmir öz havasını çalmağa başlayır.

Muxtar kişi oğlunu vaxtilə Ağbavadan gəlib Sarallarda yaşayan ustad Aşıq Məhəmmədin yanına aparıb deyir: "Aşıx Məhəmməd, başına dönüm, bu uşağı yoxla, xoşuna gəlsə, qoy yan-yörəndə hərrənsin, əl buyruqçun olsun". Dünyagörmüş Aşıq Məhəmməd ustad gözü ilə Əmiri başdan-ayağa süzür, səsini, şeir deməsin yoxlayır və "A Muxtar kişi, uşax səmitdi, fərəsətdi uşağa oxşuyur. Qoy qalsın. Bizim Mehralıynan bir yerdə oynuyar". Gənc və istedadlı Əmir Aşıq Məhəmmədə şəyirdlik etdiyi müddətdə ondan çox şeylər öyrənir. Təəssüf ki, ustad-şəyird münasibəti uzun sürmür. İkinci dünya müharibəsi (1941-1945) illərində Aşıq Məhəmməd ailə vəziyyəti ilə əlaqədar Sarallardan köçür.

**SÖZARASI:** Əmir sazla davranmağı öyrənəndən sonra, Qurvanalı Yuxarı Güləverli İsmayıl yeznəsinin qara sazını ondan alıb əmisi oğlu Əmirə hədiyyə edir. Hərdən Əmir öz dünyasına qapılanda heç kəsi eşit-

məz, "əlini ağdan qaraya vurmazdı". Belə hallarda Qurvanalının acığını tutduranda, xətrinə dəyəndə, sözünə baxmayanda o, sazı aşığın əlindən alır, könlünə aşıq havası düşəndə isə sazı geri Əmirə qaytarıb çalıb-oxutdururmuş.

Aşıq Məhəmməd köçüb gedəndən sonra, Muxtar kişi sənətin yarımçıq qalmaması üçün Əmiri Cənubi Azərbaycandan Çürük Qəmərliyə (*vaxtilə Bolnisi şəhərinin yaxınlığında yaşayış məntəqəsi-Ə.Y.*), oradan da Sarallar elinə gəlib özünə yurd-yuva quran, həm molla, həm də aşıq kimi tanınan Məşədi Söyünün (*ona el arasında Tat Söyün də deyirdilər-Ə.Y.*) yanına aparır: "A Maşadı Söyün, əl mənim, ətəy sənin, bizim Əmiri qoltuğunun altına çəy, sənəti başa vursun". Məşədi Söyün gənc Əmirin qabiliyyətinə bələd olduğundan onu şəyirdliyə götürür və oğlu Əmiraslanla birlikdə sənətin sirlərini cənub aşıq mühiti tərzində öyrədir. Məşədi Söyünün tələbkarlığı ilə Əmirin aşıq sənətinin sirlərinə üç ilə yiyələnməsi ona ustadın hörmət və sevgisini qazandırır. Güclü hafizəsi, möhkəm yaddaşı olan Əmir ustadı Məşədi Söyünün öyrətdiyi şeirləri, söylədiyi dastanları "ağızdan" götürürdü. Təəssüf ki, bu ustad-şəyird münasibəti də çox davam etmir. Məşədi Söyün "Stalin rejiminin" Türk xalqlarına və müsəlmanlara qarşı apardığı çirkin siyasətin "qurbanına" çevrilir. Təzəcə yerini "qızdırdığı" yurddan, qaynıyıb-qarışdığı Sarallar camaatından, varlığı qədər sevdiyi ailəsindən Məşədi Söyünü zorla ayırıb sürgün edirlər. O, gedəndə Əmirə deyir: "Oğul, sazı sinəndən qoyub zəhmətimi itirsən, gorum od tutub yanar. Sənəti yaşadan sənətkar ol".



Ustadına qarşı olan haqsızlıqlardan sarsılan gənc Əmir sənətə son qoymaq istəyir. Lakin sənətin, sazı-sözün qədrini bilən Muxtar kişi oğlunun mənəvi taleyinin uğursuzluğundan çox məyus olur, onun sənətdə uğur qazanması naminə əlindən gələni əsirgəmir. O, xeyli fikirləşdikdən sora qərara alır ki, Faxralı şair Nəbi oğluna dəyərli, mənalı söz və şeirləri

öyrətsə, daha yaxşı olar. Elə də edir. Şair Nəbi iki ay Sarallarda, Muxtar kişinin ailəsində gənc Əmirə haqdan gələn şeirləri öyrədir.

Ustadı Məşədi Söyünün təlimi nəticəsində Cənubi Azərbaycan aşıq mühitinin təsiri altına düşən Aşıq Əmir bir müddət cənublu aşıq qardaşlarımızın yolu ilə çalıb-oxuyurdu. Bu da yerli aşıqsevərlərin, hətta, Aşıq Əmirin özünə də xoş gəlmirdi. Kəpənəkçi Qasım İsmayılov və Qoçulu Aşıq Qəhrəman (1950-1952-ci illərdə Sarallarda Qasım kolxoz sədri, Qəhrəman isə hesabdar işləyirdilər. Qəhrəman kişi bu illərdə tez-tez Aşıq Əmirin yanına gedir, aşıq sənətinin sirlərini öyrənirdi – Ə.Y.) Əmirin Borçalı aşıq məktəbi yolunda çalıb-oxuması üçün müvəqqəti qonşu Çataq kəndində yaşayan (1946-1956-cı illərdə Çataqda yaşayıb – Ə.Y.) Aşıq Söyün Saraçlı sənətindən bəhrələnməyi, ifa tərzini, avazını və ləmsini dəyişməyi məsləhət görürlər.

Aşıq Əmir Borçalı aşıq məktəbinin əvəzsiz yetirməsi, çalğısı, məlahətli səsi, şirin danışığı, aşıq sənətinin gözəl bilicisi və klassik aşıq havalarının mahir ifaçısı olan Aşıq Söyün Saraçlının ilk şəyirdi olur (təəssüflər olsun ki, bəzi aşıqlar Söyün Saraçlının ölümündən sonra özlərini onun “ilk şəyirdi” kimi ictimaiyyətə təqdim edirdilər). Beləliklə, Aşıq Əmirin Borçalı aşıqları kimi çalıb-oxuması, sənətin sirlərini öyrənməsi üçün Aşıq Söyün Saraçlı şəyirdindən heç nəyi əsirgəmir və zaman keçdikcə zəhmətinin ilk nübarı kimi onunla oba-oba, oymaq-oymaq gəzib el şənliklərini, toy məclislərini birgə idarə edirlər. Aşıq Əmir bununla ustadın etimadını qazanır, üzünü ağardır. Aşıq Əmir Aşıq Söyün Saraçlının öyüd-nəsihətlərinə, məsləhət və təkliflərinə əməl edə-edə düz beş il ona həm şəyird, həm də yoldaş olur. Böyük ustad hərdən zarafatla Əmirə deyərdi: “Aşıq Əmir, sənin də çöpünə Söyünnər düşüf. Nə verifsən ki, bu Söyünlərdən alammersan?”

Aşıq Söyün Saraçlının xeyir-duaları ilə sənət dünyasına qədəm qoyan Aşıq Əmir müstəqil məclislər aparır. Qabiliyyəti, səhnə mədəniyyəti, şirin səsi, kövrək və yanıqlı zəngulələri gənc aşığı dilə-ağıza salır, hörmət qazandırır, aşıqsevərlərin sevimlisinə çevirir. Sənətə gəldiyi ilk illərdə Başkeçidin Hamamlı elinin gözəl sənətkarı, zurnaçı Alı Qara (mərhum ustad aşıq Hamamlı Vəkil Əliyevin əmisidir – Ə.Y.) 1956-1958-ci illərdə Aşıq Əmirin yanında balaban çalmış, bölgənin ağır toy məclislərini aparmışdılar. Lakin bu cütlüyün “ömrü” uzun olmur, çünki Borçalı aşıq sənəti ta qədimdən sırf sazla təmsil olunub.

Aşıq Əmir sənətə təsadüfi gəlməmişdi. Onu bu sahilsiz və dərin sənət dəryasında qəvvaslıq etdirən qəlbinin tükənməz arzuları, böyük xalq məhəbbəti idi. Aşıq Əmir bu sənətin sonsuz dərinliklərdən çıxardığı inciləri qan yaddaşına hopdurur və onlardan yeri gəldikcə istifadə edərək

sənətdə özünəməxsus zirvəyə ucaldı, günəş kimi parladı. Aşıq Əmir şirin dili və ləhcəsi ilə, könül oxşayan ifa və səlis danışığı ilə dinləyicini ram edir, riqqətə gətirirdi.

**DAHA BİR SÖZARASI:** Aşıq Əmir Ağbavalı ustad Aşıq Məhəmmədə şəyirdlik etdiyi illərdə Borçalının adlı-sanlı ustad aşıqları Aşıq Sadıqla qardaşı Aşıq Məmməd Sarallar elində Muxtar kişiyə qonaq olurlar. Ustad qardaşların qarşısında Aşıq Məhəmmədin şəyirdləri – Mehralı ilə Əmir çalıb-oxudular. Aşıq Sadıq üzünü qonaqlara tutub deyir: "Mehralını deyə bilmərəm, amma Əmir gələcəyin istedadlı və tanınmış aşığı olacaq".

Aşıq Əmir sadə insan olduğu kimi, həm də, təvəzökar və əvəzsiz aşıq idi. Onlarca aşıq havalarını ustadlarından öyrəndiyi kimi, klassik ölçü-biçimdə çalıb-oxuyar, dastanları ilkin variantdakı kimi danışardı. Onun ecazkar səsindən, xoş avazından, səlis danışığından doymaq olmurdu. Uzun və fasiləsiz zəngulələri, oxuduğu mənalı şeirlər ürəklərə qeyrət, könüllərə saf məhəbbət və yağı düşmənlərə nifrət hissləri oyadırdı.

Onun aşıq kimi ad-san almasında, hörmət qazanmasında və ustadlaşmasında müəllimləri Aşıq Məhəmmədlə Məşədi Söyünün, Aşıq Sadıqla Aşıq Xındı Məmmədin, Aşıq Söyün Saraçlıyla Aşıq Əmrahın, eləcə də, Faxralı şair Nəbinin böyük və əvəzsiz xidmətləri olmuşdur. O, həzin xalları və eydirmələri, yanıqlı boğaz xırdalıqları, şaqraq gülüşlü qaravəlli söyləmələri, çalıb-oxumaları ilə sevildi.

1992-ci ildə, ana təbiətin oyandığı, gül-çiçəklərin qönçələndiyi, xanım-xatun qızların durnagözlü bulaqların başına yığıldığı aprel ayının bir yaz günündə Aşıq Əmir dünyasını dəyişib haqqa, müqəddəslərin ruhuna qovuşaraq, anamız torpağın isti qoynuna köçüb əbədiləşdi.

Aşıq Əmir eldən gedən dəyərli insanlardan, ustad aşıqlardan biri idi. Hərdən fikirləşib təəssüflənirəm: "Niyə o da digər ustad sənətkarlar kimi vaxtında araşdırılıb üzə çıxmadı? O, çıraqla axtardığımız saz-söz "xəzinələrini", klassik aşıq ədəbiyyatının yazılmamış, işıq üzü görməyən, "xoruz səsi eşitməyən" aşıq poeziyası incilərini və bir çox dastanlarımızın ilkin variantını özü ilə apardı. Aşıq Əmir sadəliyindənmi, təvəzökarlığındanmı, halallığındanmı, yoxsa, hamını özü kimi bildiyindənmi üzə çıxa bilmədi?

Cılız, arıq vücudlu Aşıq Əmir xalqın müqəddəs və tükənməz mənəvi sərvətini, ağır yükünü qəlbinin dərinliyində daşıyırdı. Bu ağır yükü daşımağa və yaşatmağa vadar edən ondakı insani keyfiyyətlər, xalqa bağlılıq, sənətə və sənətkara olan məhəbbət, İlahi sevgi və mənəvi borc idi.

Aşıq Əmirlə sağlığında tez-tez görüşərdik, aşıq sənəti ilə bağlı söhbət zamanı deyərdi: "Qardaşoğlu, Dədə Qorqudun əsl törəmələri biz bor-

çalılarıq. Bizim suyumuzun hər damlasınnan, havamızın hər udumunnan, torpağımızın hər qarışınnan, dağımızın-aranımızın hər yerinnən saz ətri gəlir, saz havası duyulur. Bavalarımız da, biz də aşıx havalarınnan mayalanmışıx. Qarabağıllar "muğam" üstə ağlıyan kimi, biz də saz üstə - "Mansırı", "Dilqəmi", "Qaraçı", "Urfani", "Məmmədbağırı", "Yanıq Kərəmi" üstə ağlıyırıx".

Aşıq Əmirin hər zaman ərköyün uşaq kimi nazı ilə oynayan, qulluğunda duran, qayğı göstərən, "ağrın alem, orda otuma, burda otu", "qurvan olum, onu yemə, bunu içmə", "üstünü ört, soyuq dəyər" deyəni ömür-gün yoldaşı Nigar xala idi. O, Aşıq Əmiri "püfə-püflə" saxladı. Qoymazdı üstünə toz qona, ayağına palçıq yapışa. Hətta, ərinin aşıq libasını Nigar xalanın özü ölçüb-biçər, özü tikərdi. Nigar xala, doğurdan da, Aşıq Əmir üçün Nigar idi. İndinin özündə də "Əmir" deyib, "Əmir" eşidir. Gəlini Eminə xanımın da istiqanlıqda, qayğıkeşlikdə, ədəb-ərkan yolu gözləməkdə tayı-bərabəri yoxdu. Ölüm ayağında olan qayınatası Əmirə: "Nəyimiz var, satıb səni bu baladan qurtarajam", – deyir. Qəhərdən gözləri dolan Aşıq Əmir: "Mənimki qutarıf, a bala, üzün ağ olsun. Haqqını halal elə", – deyib dikəlir və gəlninin alnından öpür. Nigar xala ilə Eminə xanım ana-bala kimi böyük ustad Aşıq Əmirin qulluğunda durublar.

Oğlunun vaxtsız faciəli ölümü Aşıq Əmiri çox sarsıtdı. Bir müddət sazı əlinə almadı. Qohum-qardaşın, dünyagörmüş kişilərin, ustad aşıqların məsləhət və xahişi ilə yasdan çıxdı, məclislərə getdi. Bu itkidən sonra o, həmişə qəmli və kövrək havalar oxuyardı.

Aşıq Əmir heç vaxt unudulmur, heç vaxt yaddan çıxmır, çünki onun qədirbilən şəyirdləri (bu gün özləri ustalıq zirvəsinə qalxsalar da) ağızdolusu ustadlarından danışırlar. Dəllər elinin istedadlı sənətkarları – Aşıq Əhəd (1960-1963-cü illərdə ilk şəyirdi olub), sazbənd-aşıq Kövrək Murad, sazbənd-aşıq Bafəli, Aşıq Mehdi, zurnaçı-aşıq Qafqaz (son şəyirdi), Cəfərli Aşıq Vəli, Faxralı Aşıq Alı, Qoşakilsəli Aşıq Əhməd, Sarallar Musa və Selimxan Hüseynov qardaşları, ustadın oğulları Müslüm, Cəhəngir, nəvələri Məzahir, Vüqar, Səbinə xanım və digərləri Aşıq Əmirin sənət məktəbindən bəhrələnib, sənətkarlıq "süzgəcindən" keçib, aşıqlıq "məngənəsində" bərkiyiblər.

Aşıq Əmirin xalq qarşısında əvəzsiz xidmətləri olub. Vaxtılə onunla oturub-duranlar, dostluq və yoldaşlıq edənlər, şəyirdi olanlar, doğma-əzizləri, eləcə də, aşıqsevərlər ustadla fəxr edə bilərlər, çünki sənəti yaşadan sənətkar heç vaxt unudulmur.

# SƏDNİK PAŞA PİRSULTANLI
## (Paşayev Sədnik Xəlil oğlu)



Azərbaycan elminə ağır itki üz verib. Filologiya elmləri doktoru, professor Sədnik Paşa Pirsultanlı 2013-cü il avqustun 26-da ömrünün 84-cü baharında qəflətən vəfat edib.

Sədnik Paşa Pirsultanlı (Paşayev Sədnik Xəlil oğlu) 1929-cu il mayın 20-də Daşkəsən rayonunun Qazaxyolçular (Pirsultan) kəndində anadan olub. Natamam orta təhsilini Qazaxyolçular kəndində, orta təhsilini Dəstəfur internat məktəbində alıb. 1950-ci ildə H.B.Zərdabi adına Kirovabad Dövlət Pedaqoji İnstitutunun (indiki Gəncə Dövlət Universitetinin) birinci kursuna qəbul olunub, 1954-cü ildə Azərbaycan dili və ədəbiyyatı fakültəsini bitirib. 1955-ci ildən 1970-ci ilə qədər "Yeni Daşkəsən" (Daşkəsən), "Mübariz" (Goranboy) və "Yenilik" (Kəlbəcər) rayon qəzetlərində redaktor, "Kirovabad kommunisti" qəzetinin məsul katibi vəzifələrində çalışıb. 1970-ci ilin oktyabr ayında H.B.Zərdabi adına Kirovabad Dövlət Pedaqoji İnstitutuna müsabiqə yolu ilə müəllim qəbul olunub, baş müəllim, dosent vəzifələrində çalışıb.

O, 1970-ci ildə "Ağdabanlı Qurban və müasirləri" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 1990-cı ildə isə "Azərbaycan xalq əfsanələri və onun tədqiqi problemləri" mövzusunda doktorluq dissertasiyasını müdafiə edrək filologiya elmləri doktoru elmi dərəcəsini almışdır.

Professor Sədnik Paşa Pirsultanlı 60 ilə yaxın folklorumuzun toplanması, nəşri və tədqiqi ilə məşğul olub, onlarla kitabı, yüzlərlə elmi məqaləsi nəşr olunub.

S.P.Pirsultanlı Azərbaycanın Əməkdar mədəniyyət işçisi və Əməkdar müəllim fəxri adlarına layiq görülüb, Təhsil Nazirliyinin "Qabaqcıl Təhsil işçisi" döş nişanı ilə təltif edilib. Azərbaycan Aşıqlar Birliyi İdarə heyətinin və "Ozan dünyası" jurnalının redaksiya heyətinin üzvü olan Sədnik müəllim uzun illər Gənmcəbasar bölgəsi aşıqlarına rəhbərlik edib. Əsərləri bir sıra xarici ölkələrin elmi jurnallarında dərc olunub, respublika və beynəlxalq elmi konfrans və simpoziumlarda məruzələrlə çıxış edib.

2005-ci ildə "Aztelefilm" yaradıcılıq birliyi dövlət sifarişi ilə professor Sədnik Paşa Pirsultanlı haqqında "Pirsultanlı" adlı sənədli televiziya filmi çəkib.

Sədnik Paşa Pirsultanlının xatirəsi onu tanıyanların qəlbində hər zaman yaşayacaqdır. Allah rəhmət etsin!

**AZƏRBAYCAN AŞIQLAR BİRLİYİ**



**Şəfa VƏLİYEVA**

## SƏDNİK PAŞA PİRSULTANLININ XATİRƏSİNƏ...

***Azərbaycan elminə üz verən itkinin ağrısı, acısı hələ uzun zaman davam edəcək...***

Uşaqlıqdan şeirə, saz havalarına marağım vardı. Bu marağı məndə nənələrimdən eşitdiyim dastanlar, şeirlər, nağıllar formalaşdırmışdı. Böyüdükcə, ədəbiyyatı xüsusi sevgiylə oxuyurdum. Çalışırdım ki, şeirləri, sözləri olduğu kimi dilə gətirim, qoşmanın ahəngini pozmayım. Deyəsən, cidd-cəhdlərim boşa getmirdi. Çünki, ədəbiyyat dərsindən həmişə əla qiymətlər alırdım.

Və ədəbiyyat sevgisi məni nəinki Azərbaycanın, bütün türk dünyasının tanınmış folklorşünası, professor Sədnik Paşa Pirsultanlının yanına gətirib çıxardı. Az zaman içərisində mənim saza-sözə olan marağımı duymuşdu "folklorumuzun yorulmaz dərvişi". Hər iş gününü Aşıq Ələsgərin "Ovsun almaz mara döndü, nə döndü" misrasıyla başlayır, Səməd Vurğunun bu bəndiylə sona yetirirdik:

*Yenə qılıncını çəkdi üstümə,*
*Qurbanı olduğum o ala gözlər.*
*Yenə cəllad olub durdu qəsdimə,*
*Qələm qaş altında piyalə gözlər.*

Sədnik Paşa Pirsultanlı Azərbaycan şeir tarixində heca vəzninin inkişaf tarixini hələ uzun illər əvvəl araşdırmışdı. Əsərin çapa hazırlanmasında az da olsa əmək sərf etmək mənə də qismət oldu. Tədqiqat kitab şəklinə salındı, çap olundu. Hazırlıq prosesində kitabdakı şeirləri mənə xüsusi vurğu ilə oxutdururdu. Əzbər bildiyim şeirə çatanda başımı kitabdan qaldırır, şeiri xüsusi ahənglə söyləyirdim. Sədnik müəllimin

gözləri yaşarırdı. Bunu gizlətməyə çalışırdı. Ancaq eynəyini çıxarıb əlinin arxasıyla gözlərini ovuşdurmağından bilirdim kövrəldiyini...

– Şeirin özündən yurdu şirindi, bala. Onun yurdunu bilməsən elə deyəmməzsən o şeiri, – deyirdi.

Hansı şeirdə azca xaric ahəng duysa, onun yurdunu anladardı. Saatlarla qulaq asardım bu şeir hekayətlərinə, doymazdım. Həmin anlarda 84 yaşlı bir şair görürdüm qarşımda. Azərbaycan şeir sənətinin dərinliyində Xəstə Qasımın dediyi əsl qəvvas kimi üzən bir şair.

Ömrünü folklor nümunələri ilə süsləyən, Vətənimizi qarış-qarış gəzən Sədnik Paşa Pirsultanlı hansı aşığın hansı havanı necə çalmasını da bilirdi. Araşdırdığı, topladığı bütün şeirlərin, yaradıcılıq nümunələrinin yarandığı şəraiti də öyrənmişdi. Bir şeiri söyləməzdən əvvəl tarixi bir hekayət, sevgi hekayəsi, əfsanəvi hadisələr söyləyirdi. Aşıq Bəstinin "Lalə" şeirindəki

*Yarın qanlı köynəyi tək,*
*Qızarır yol üstə Lalə!*

- misralarını bir cavan oğlanın xəncərlə doğranmasını danışandan sonra dilə gətirirdi. Göz önündə canlanan bu faciəvi tablonu düşünərkən Bəstinin can yanğısını duymamaq olmur. Və bu misralar əzbərimizə çevrilir.

Bir dəfə "Koroğlu" eposundan danışırdı. Aşıq sənətindən başladığı elm cığırından əfsanələr diyarına necə yol almağını söylədi:

– "Koroğlu" havalarını toplayırdım, bir də baxdım ki, Koroğlunun bütün havaları "ölləm-öldürrəm" deyir, təkcə biri, "Şirinqala" yanır-yanır, ağlayır. Dedim, bu nədi? O boyda paşalara, xanlara qan udduran Koroğlu nəyə ağlayıb görəsən? Başladım axtarmağa. Getdim çıxdım "Şirin qala"ya... Demə, o boyda Koroğlunu da məhəbbət ağladarmış...

Sədnik müəllim bunu danışdıqca kövrəlirdi. Onun bu xalqın oğluna, qızına necə yandığını bu için-için göynəməyindən bilirdim. Hardasa özümü qınayırdım ki, niyə gec tanımışam bu insanı? Öz xalqı, vətəni üçün yaşayan, yaşadan folklorşünas yurdumuzun hər daşının, hər qarış torpağının tarixini bilirdi.

Əzizə Cəfərzadə "Anamın nağılları" kitabından danışanda belə bir fikir söyləmişdi:

– Anam mənimçün hikmət sandığıydı. Nədə çətinlik çəksəm, nə gərəyim olsa, o sandığın ağzını açardım. Lazım olanı götürərdim.

Bu sözləri televiziyadan eşidəndə hələ uşaqdım. Amma yaddaşıma yazılmışdı. İndi deyirəm ki, Sədnik Paşa Pirsultanlı mənim üçün hikmət

xəzinəsinin özü idi. Xərclədikcə azalmaz, dərinliyinə vardıqca bir pillə ucaldığım xəzinə...

Avqustun 26-sı dünyayla vidalaşdı Sədnik Paşa Pirsultanlı... Onu "filologiya elmləri doktoru, professor" kimi təqdim edəndə acıqlanırdı. "Həm də Azərbaycan Yazıçılar Birliyinin üzvü!" – deyə xüsusi vurğulayırdı. Əvvəlcə bu, mənə qəribə gəlirdi. Lakin 742 səhifəlik "Pirsultan pinarı" şeirlər, 404 səhifəlik "Pirsultan soyları, Pirsultan köyləri" kitablarıyla tanış olandan sonra onun bu fərəhinin səbəbini anladım... Onun buna haqqı vardı... Sədnik Paşa Pirsultanlı elm fədaisi idi, bu, danılmazdır... Ancaq o, gözəl yazıçı və kövrək ruhlu bir şair idi... Bunu duymaq, anlamaq lazımdı...

Sədnik Paşa Pirsultanlı aşıq şeirinin təcnis janrına o qədər vurğun idi ki, gənc şairlərdən kiminsə yaradıcılığında cinaslı qafiyələr, sözlər görsə, onu dönə-dönə mənə oxutdurardı. Son günlər tez-tez eşitmək istədiyi Bəxtiyar Hidayətin "Güləsərindi" şeiri idi:

*Etdim ömrü gülə-gülə sərgüzəşt,*
*Bülbülün fəğanı gülə sərgüzəşt.*
*Eylə bu dərdimə, Güləsər, güzəşt,*
*Qəlbimdə bir yer var, Güləsərindi...*

Məndən dəfələrlə özünün hansı şeirini xoşladığımı soruşardı. Hər dəfə də cavabım eyni olardı:

– "Dərin ümmanlara salar, öldürər..."

Hiss edirdim ki, xətrinə dəyir:

– O boyda şeirlər var axı...

"Öldürər" şeirinin necə yazıldığını özündən eşitdiyim kimi, danışardım... Bu şeir onun həyat yoldaşı Səfurə xanımla nişanlı olduğu günlərin yadigarıdır... Kövrək-kövrək gülümsəyirdi:

– Hələ öyrənəcəksən-deyərdi...

Bəli... Hələ öyrənəcəkdim... Sədnik Paşa Pirsultanlıdan öyrəniləsi çox şey vardı... Ömrünün son gününədək "Azərbaycan folklorunda öyrənilməmiş nə qaldı?" – deyə narahatlığını gizləmədi.. Onun narahat qəlbini zaman susdursa da, dediyi, söylədiyi, Azərbaycan, eləcə də, türk dünyasının elminə bəxş etdiyi töhfələr hələ yaşayacaqdır...

*Alimin arxivindən*

**Sədnik Paşa PİRSULTANLI**
**Filologiya elmləri doktoru, professor**

# TÜRKMƏN BAXŞISI VƏ ONUN SAZI

Ən qədim və ilkin formasını mühafizə edib yaşadan ulu saz çeşidli simli çalğı alətlərindən biri də dütardır. Bu simli çalğı aləti türkmən, özbək, qaraqalpaq, uyğur, qırğız, qazax və başqa xalqlar arasında yayılmışdır. Təxminən XX əsrin 30-cu illərinə qədər dütara ipək tel, ondan sonra isə nazik sim qoşulmuşdur.

Saz sənəti aləmində türkmən dütarının, türkmən baxşısının xüsusi yeri vardır. Türkmənlər aşığa baxşı, dütara isə həm də saz deyirlər.

Dütarın iki simi, qolunda on üç pərdəsi, o cümlədən «Baş pərdə», «Nəvai pərdəsi», «Zərin pərdə», «Lal pərdə», «Gənzəvi pərdəsi», «Orta pərdə», «Şirvan pərdəsi» vardır.

Azərbaycan aşığı sazı təzənə ilə, türkmən baxşısı isə dütarı sağ əlin beş barmağı ilə çalır.

Azərbaycan aşığı sazın bağını sağ qoluna keçirib adətən ayaq üstə çalıb-çağırır, ortada gərdiş edir, bu tərzi-hərəkət gərdiş, gəzişmələr müəyyən mənada ifaçılığı xeyli zənginləşdirir.

Türkmən baxşısının da ifa tərzi maraqlıdır. Türkmən baxşısı dütarını oturub çalır. Bu, onun tarixən inkişaf edib gələn ifaçılıq ənənələrinə daha çox uyğun gəlir. Türkmən baxşısı sazı bağrına basıb, bütün varlığı, ruhu və qəlbi simlərə elə bağlanır, onu elə çılğınlıqla ehtizaza gətirir ki, insan öz gözünə və qulağına inana bilmir ki, bu sehirkar səsləri çıxaran, rəngarəng musiqi lövhələri yaradan bu iki simdir. Elə bil ki, qəlbləri əfsunlayan bu səslərin bir ucu əlçatmaz qərinələrin o tayından gəlir, xatirələr söyləyir, öz səsini bu günlərin səsinə qoşub əbədilik qazanır. Türkmən yazıçısı Xudayberdi Durduyevin dili ilə desək, dütar çalan «şabram şelpələr» (*ustad əllər* – S.P) təkrarolunmaz, əsrarəngiz, qəlbə nur saçan musiqi lövhələri yaradır.

Türkmən sazında simlərin sayının azlığı heç də onun imkanlarını məhdudlaşdırmır. Dütar dediyini deyir. Əsrlərin yadigarı olan bu qoşa qanad tellərin biri aşiq, biri məşuq, biri həsrət, biri vüsal, biri yanğı biri yağış, bir elin harayı var, sevinci var tellərdə. Bir elin dünəni var, bu günü var, sabahı var bu tellərdə. Bir elin qəlbi yaşar, özü yaşar, hissi yaşar bu tellərdə.

Türkmənlər dütar havalarına «muqam» deyirlər. Lakin bunların bizim anlayışımızdakı muğamlarla əlaqəsi yoxdur. Sadəcə olaraq

«muqam» sözündən bir musiqi termini kimi istifadə edilir. Hətta baxşılar qoşma, gəraylı, müxəmməs şeir formalarına da qazal (qəzəl) deyirlər. Eyni zamanda «qoşqu» ifadəsini də işlədirlər. Əlbəttə «muqam» və « qazal» dütara bağlı ilkin adlar deyildir. Bu şeir və musiqi terminləri sözsüz ki, türkmən baxşısının yaradıcılığına sonradan gəlmə poetik adlardır. Deyirlər ki, Azərbaycan sazı ilə Türkmən sazının avazında bənzərlik azdır. Əlbəttə, burada müəyyən qədər həqiqət vardır. Çünki türkmənlərin, türkmən baxşısının danışıq tərzi necədirsə, musiqisi də elədir. Musiqisi hər şeydən əvvəl bizcə canlı danışığın, tələffüzün, intonasiya və söz vurğusunun, səs ahənginin əks-sədasıdır.

Lakin saz və dütar melodiyaları içərisində elələri var ki, onların arasında yaxınlığı inkar etmək olmaz. Türkmən baxşısı «Koroğlunun at oynadışı» havasını çalanda qeyri-ixtiyari Salyan aşıqlarının repertuarındakı «Atlı Koroğlu» yada düşür. Dütara bağlı «Bal Sayat» havası ilə Borçalıda çox ifa edilən «Sultanı» saz havasının çalarları arasında bənzərlik daha güclüdür. Maraqlıdır ki, «Bal Sayat» Türkmənistanda ən çox sevilən havalardandır. Toy məclisində hansı dastan söylənir-söylənsin, həmin dastan «Bal Sayat» melodiyası ilə bitməlidir. Türkmən baxşıları arasında bu, bir ənənəyə çevrilmişdir.

«Bal Sayat»da həyata çağırış çox güclüdür. Dütar dilləndikcə aşağıdakı misralar nəqarət kimi səsləndirilir:

*Gəl Sayat bağdadı, bağda,*
*Bal Sayat bağdadı, bağda.*

İfaçılıq tərzlərinə görə türkmən baxşıları üç qrupa bölünür: Aydımçı – o, yalnız məlahətli səslə oxumağı bacarır; dütarçı – o, yalnız dütar çala bilir; dastançı baxşı – o, baxşılar içərisində ən kamili sayılır. Çünki həmin baxşı dastan söyləyir, eyni zamanda çalıb-oxumağı bacarır. Bir sözlə, dastançı baxşı təkbaşına toy və məclis yola verə bilir.

Məlumdur ki, aşıq və baxşı məktəblərini bir-birindən şeir və musiqiyə, eləcə də, dastana görə fərqləndirmək çətindir. Çünki bütün zona aşıqları və baxşıları qoşmaya qoşma, dastana dastan deyirlər. Bunların yollarını ancaq ifa zamanı ayırır, müəyyən dərəcədə bir-birindən fərqlənirlər. Məsələn, Marı (Mərv) aydınçıları məlahətli səsləri, Göytəpə dütarçıları gözəl ifa tərzləri, Taşauz baxşıları isə mahir dastançılıqları ilə seçilirlər.

Türkmən baxşısının repertuarında «Qonur baş», «Novayı», «Göytəpə», «Soltan Söyün», «Çığalı», «Qara Nərgiz», «Müxəmməs»,

«Nəcəfi», «Yıldızdağ Koroğlusu», «Atçapar» və başqa dütar havaları vardır.

Əlbəttə, aşıq və baxşı ifaçılıq məktəblərinin varlığını təkcə bir zona aşığının və ya baxşısının oxumaqda, o birinin çalmaqda, digərinin dastançılıqda üstünlük təşkil etməsi ilə müəyyənləşdirmək olmaz. Bunların özlərini fərqli şəklə salan məhz coğrafi-etnik mühit, dəb və toy adətləri, yerli əhalinin əmək məşğuliyyəti, yerli folklorun və ədəbi mühitin təsiri, qonşu xalqlarla əlaqələr, təsirlər və başqa ictimai amillər olmuşdur.

Baxşı sənəti Türkmənistanın hər guşəsində: Taxtabazarda, Qarrıqalada, Bayraməlidə, Tecendə, Bahardendə və başqa yerlərində geniş yayılıb. Lakin türkmən baxşı ifaçılığı məktəblərini əsasən aşağıdakı şəkildə qruplaşdırmaq olar: Taşauz baxşı məktəbi; Marı baxşı məktəbi; Göytəpə baxşı məktəbi.

«Koroğlu», «Şahsənəm-Qərib», «Leyli Məcnun», «Hürüliqa-Həmra», «Sayatlı-Həmra», «Nəcəfoğlan» və başqa türkmən xalq dastanları əsasən Taşauz baxşılarının repertuarında yaşayır.

Ümumilikdə baxşı sənətinin inkişaf tarixinə nəzər saldıqda bu qənaətə gəlmək olur ki, baxşı sənətinin ilk qaynaqları Taşauzdan başlanır. Onu da qeyd etmək lazımdır ki, Tovuzda (Azərbaycan SSR) və Taşauzda (Türkmənistan SSR) aşıq-baxşı yaradıcılığı və sənəti eyni dərəcədə geniş yayılmış, qədim ənənələrə və çox dərin ictimai köklərə malikdir.

Ümumiyyətlə, axtarışlar və araşdırmalar bir də onu göstərir ki, elə bəşəri özək-ana epos və dastanlar var ki, onlar milli sərhəd tanımırlar. Məsələn, «Koroğlu», «Aşıq Qərib», «Tahir və Zöhrə», «Əsli-Kərəm» və sair.

Azərbaycan aşıq ifaçılığının zənginləşməsində neyin, baxşı ifaçılığının kamilləşməsində də qıcakın (kamançanın) xüsusi rolu olmuşdur. Qıcakı ilk dəfə baxşı ifaçılığına Taşauz baxşısı gətirmişdir. Təxminən XIX əsrin başlanğıcında Taşauz baxşısının istifadəsində olan qıcak həmin əsrin ikinci yarısında Marı, XX əsrin əvvəllərində isə Göytəpə baxşılarının ifaçılıq sənətinə daxil olmuşdur.

Türkmən xalq şeirinin, baxşı yaradıcılığının, baxşı sənətinin inkişafında və zənginləşməsində Məxdimqulu, Mollanəpəs, Kəminə, Zəlili, Seyidi, Nurmuxammet Əndəlib kimi klassik söz ustaları ilə yanaşı, sənətdə yeri, mövqeyi olan saz (dütar) ustalarının, gözəl ifaçıların və dastançıların böyük xidmətləri olmuşdur.

Ayrı-ayrı fərdlər tərəfindən yaradılan şeir və musiqini, dastanı bir obadan başqa obaya çatdıran, eldən-elə yayan, yaşadan, onu məhəlli vəziyyətdən çıxarıb kütləviləşdirən, onu ümumxalq malı edən, bütövlükdə xalq sözünə, xalq sənətinə çevirən aşıq və baxşılar olmuşlar.

Baxşı sənətinin tarixi inkişafında Nobatniyaz baxşının, Əli baxşının, Veyran baxşının, Durdı baxşının, Şükür baxşının, Ata baxşının və başqalarının böyük xidmətləri vardır. Baxşı yaradıcılığı və ifaçılığı Sarı baxşının, Xalı baxşının və Saxı Cabbarovun timsalında özünün yeni mərhələsinə daxil olmuşdur.

Bu gün türkmən yurdunda Saxı Cabbarovun ifaçılıq ənənələrini davam etdirən onlarla gözəl sənətkar vardır.

Dütar dillənəndə, baxşının avazı gələndə Məxdimqulunun şeir dünyası, Saxı Cabbarın sənət aləmi yenidən gülür, barlı ağac kimi yenidən yaşıllaşır, çiçək açır, tükənməz ömrünün yeni günlərini yaşayır. Türkmən torpağında baxşı sənəti həmişəbahar, həmişəyaşıl bir bağa bənzəyir. Elə bir bağ ki, orada həmişə bülbül ötür, mahnı çağlayır.



**Qəzənfər PAŞAYEV**
filologiya elmləri
doktoru, professor



# ÖMRÜN VƏFA ETMƏDİYİ AŞIQ-ŞAİR [1]

Aşıq Aydın Çobanoğlunun yaradıcılığını tam əhatə edən bu maraqlı kitabın əlyazmasını vərəqlədikcə gənclik illərindən dostluq etdiyim Aydını sanki yenidən kəşf etdim, digər tərəfdən də dostum haqqında çoxdan bəri söz demək arzum gerçəkləşdi. Buna görə dostumun ağıllı və savadlı qızı Aytənə minnətdaram. Kitaba ön söz yazmağı Aytən təmənna etdi. Aşıq Aydının kitabda yer alan, bir çoxunun ilk oxucusu olduğum şeirlərini oxuduqca xəyal məni ağuşuna alıb arzuların aşıb-daşdığı illərə – Aydınlı günlərə apardı. 1972-ci ilin noyabr ayı idi. İraqa 3-cü dəfə uzunmüddətli ezamiyyətə hazırlaşırdım. İnstitut dostum, şair Ələmdar İsagilə getmişdim. Ələmdar məni qarayanız, gülərüz bir gənclə tanış etdi. Diqqətimi ilk cəlb edən onun bığları oldu. O vaxt bığ saxlamaq kişilik nişanəsi hesab olunurdu. Demək olar ki, əksər kişilər bığ saxlayırdılar. Ələmdarın da, mənim də bığımız vardı.

– Tovuzludur, tələbə aşıqdır, – deyərək Ələmdar gülümsündü. Bununla Aydının mənimlə yerli olduğuna işarə edirdi.

Aydının şirin danışığı vardı. Söhbət zamanı məlum oldu ki, Texniki İnstitutda oxuyan bu gənc çağdaş poeziyamızı və aşıq yaradıcılığını yaxşı bilir. Onda bilmirdim ki, Aydın aşıq ocağından pərvəriş tapıb. Bilmirdim ki, atası Aşıq Çobandan dərs alıb. Yarızarafat, yarıgerçək dedim ki, sənin yerin Universitetin filologiya fakültəsidir (O vaxt Azərbaycanda təkcə ADU vardı). Əvvəl-axır texniki elmlərə həvəsin öləcək, – dedim.

– Elə mənim arzum ya Teatr İnstitutunda, ya da Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsində oxumaq olub, tale belə gətirdi, – dedi.

Dediklərimə o qədər də inanmasam da, tale insanın öz əlindədir, – dedim…«Ömrün etməyəcək vəfa dedilər»

---

[1] **Bu yazı nəşrə hazırlanan "Ömrün etməyəcək vəfa dedilər" kitabına ön söz kimi yazılıb.**

1975-ci ilin may ayında İraqdan vətənə qayıdanda gördüm ki, Aydın Musayev Universitetin filologiya fakültəsinin qiyabi şöbəsində oxuyur. Dostlaşdıq və dostluğumuz dünyasını dəyişdiyi günə qədər davam etdi. 1951-ci ildə dünyaya göz açan Aydın 1993-cü ildə faciəli şəkildə dünyasını dəyişdi və cəmisi 42 il ömür sürdü. Lakin insan üçün qısa olan ömür payında çox iş gördü. Tarixdə qalacaq iz qoyub getdi.

Aydın bir neçə aşıq havası bəstələmişdir. **«Səyyadı»**, **«Aygünüm»**, **«Çobanoğlu»**, Xalq şairi Zəlimxan Yaqubun sözlərinə bəstələnmiş **«Ana laylası»** və Məmməd İsmayılın "Yaman darıxmışam səninçün, ana" şeirinə bəstələdiyi hava belələrindəndir. Toylarda indi də oxunan, sevimli şairimiz Məmməd İsmayılın «Gözəldi» qoşmasına bəstələdiyi, oğlu Səyyada həsr etdiyi **«Səyyadı»** havası onun bəstəkarlığından, musiqi duyumundan xəbər verir. Havanın sözləri də başqa aləmdir:

*Yar ol, yar olana, yar olanda da,*
*Yolunu gözləsin, yorulanda da.*
*Eləsinə vurul, vurulanda da*
*Desinlər ay Məmməd, əla gözəldi.*

Aydın sonuncu misranı üç-dörd dəfə təkrar edər, gah «Desinlər ay Məmməd, əla gözəldi», gah da «Desinlər ay Səyyad, əla gözəldi» oxuyardı. Bu özü də havaya xüsusi şirinlik gətirirdi. Aydın gənclikdə «Hicrani» təxəllüsü ilə şeirlər yazırdı. Lakin sonralar atasının adını təxəllüs kimi götürərək «Çobanoğlu» təxəllüsü ilə məşhurlaşdı.

Tez-tez onu saz-söz sənətinin sərraflarının iştirak etdiyi mötəbər məclislərə dəvət etməyə başladılar. Xüsusi vurğulamaq istəyirəm ki, onun filologiya üzrə universitet savadı məclis aparmasına, insanlarla şirin münasibət qurmasına çox kömək edirdi. O, həm aşıq poeziyasını, həm də çağdaş poeziyamızı gözəl bilirdi. Özü də ilhamlı şair idi. Dünyagörüşü onu bir çox aşıqlardan fərqləndirirdi. Bir sözlə, Aydın Çobanoğlu ziyalıların sevimlisinə, xudmanı məclislərin ən arzuolunan sənətkarına çevrilmişdi. Belə məclislərdə dinləyicilər adətən aşığa söz atar, onun nəyə qadir olduğunu yoxlayardılar. Aydın elə cavab verərdi ki, hamı heyran olar, məclis daha da qızışardı. Bu, bir yandan Aydının istedadından, digər tərəfdən də aşıq ocağında böyüməsindən, bilik səviyyəsindən xəbər verirdi. Çox keçmədi Aşıq Aydın ağır məclislərə dəvət olundu.

Bir gün Şirvan aşıq məktəbinin görkəmli simalarından biri – Aşıq Qurbanxandan soruşurlar ki, indiki aşıqlardan kimi bəyənirsən? Cavab verir ki, bir kəndə iki dəfə toya aparılan aşığı.

Aşıq Aydın Çobanoğlu nəinki bir kəndə, hətta bir nəslə dəfələrlə toya aparılardı. O, elə yaradıcı aşıq idi ki, hətta tez-tez Şirvan bölgəsinə belə məclislər aparmağa dəvət alardı. Bilənlər bilir ki, onun başına gələn faciə Şamaxıdan toydan qayıdarkən yolda baş vermişdi.

Aydın Çobanoğlunu yaradıcılığının çiçəkləndiyi, sazının-sözünün, sənətinin püxtələşdiyi bir dövrdə itirdik. Mübaliğəsiz deyə bilərəm ki, o, Bakıda aşıq sənətini ən fəal və uğurla təbliğ edən, professor Qara Namazovun təbirincə desək, sazı Bakıya daimi köçürən sənətkarlardan biri idi. Aşıq Aydının qısa ömür payında gördüyü gərəkli işlərə nəzər salanda heyran olmamaq olmur. Bu qədər işi, ulu ozan-aşıq sənətini dərindən sevən, onunla nəfəs alan sənətkar görə bilərdi.



Aşıq Aydın Çobanoğlunun ilk uğurları 1975-1977-ci illərə təsadüf edib. I Ümumittifaq festivalının laureatı adını 1977-ci ildə qazanıb. 1977-1979-cu illər – gənc aşıqların respublika baxış müsabiqələrinin qalibi, 1984-cü il – Polşa Xalq Respublikası Zelena-Qura şəhərində keçirilən XI Beynəlxalq Folklor festivalının laureatı, 1985-ci ildə isə II Dünya Müharibəsində qələbənin 40 illiyinə həsr edilən Ümumittifaq festivalı laureatı, 1987-ci ildə – Böyük Oktyabr sosialist inqilabının 70 illiyinə həsr edilən II Ümumittifaq xalq yaradıcılığı festivalının laureatı, sənətdəki uğurlarına, zəhmətkeşlərin və gənc nəslin estetik tərbiyəsində mühüm xidmətlərinə görə Sov.İKP MK, SSRİ Nazirlər Sovetinin fəxri fərmanına, 1988-ci ildə Respublika Lenin Komsomolu mükafatına, 1988-ci ildə – Almaniya Demokratik Respublikasına (fevral, mart) «Dostluq səfəri»ndə Xalq çalğı alətləri ansamblı ilə birlikdə rəhbər kimi Abşeron rayonunu təmsil etmiş və çıxışlarına görə fəxri fərmana layiq görülmüşdür.

1988-ci ildə (02-08 aprel) Leninqradda keçirilən XVI «Folklor və gənclik» Ümumittifaq elmi-təcrübi konfransda «Aşıq sənətinin öyrədilməsi yolları» mövzusunda məruzə ilə çıxış edib. O, bu çıxışı ilə müxtəlif millətlərin nümayəndələrinin və sənətşünaslarının hafizəsində xalqımızın əvəzsiz incisi olan aşıq sənəti, aşıq musiqisi barədə aydın təsəvvür yaratmışdır. Keçmiş İttifaqın elm və incəsənət xadimləri, alimlər Azərbaycan Aşıq sənətinə, Aydın Çobanoğlunun maraqlı məruzəsinə və ustad Aşıq Əkbər Cəfərovla birgə ifalarına çox yüksək qiymət vermişlər. Aydın Çobanoğlunun xatirə dəftərinə yazılan təəssüratlardan:

Sənətşünaslıq doktoru Viktor Arkadyeviç Lapin: – «Musiqi beynəlmiləl dildir, buna görə də dostluq dilidir. Azərbaycan aşıqları bunu Repindəki «Yaradıcılıq evi»ndə beynəlmiləl tamaşaçılar qarşısında parlaq şəkildə sübut etdilər. Sağ olun».

Vladivastok İncəsənət İnstitutunun dosenti Şiskova Alla Viktorovna: «İlk dəfədir ki, ecazkar aşıq sənəti ilə qarşılaşıram. Qarşınızda baş əyir və Sizə çox sağ olun deyirik, Azərbaycan aşıqları!»

İvanovo-Frankovsk konservatoriyası «SSRİ Xalqları musiqisi» kafedrasının müəllimi, musiqişünas A.M.Turyanskaya: «Ecazkar aşıq sənətindən çox böyük həzz aldım. Mənə elə gəlir ki, doğma mahnılara vurğunluğu aşıqlardan öyrənmək lazımdır. Sizə böyük yaradıcılıq uğurları arzu edirəm ki, Sizin gözəl incəsənətinizlə bütün SSRİ xalqları tanış ola bilsinlər!»

Elə həmin ildə Hindistanda Abşeron rayon mədəniyyət şöbəsinin xətti ilə Sovet-Hindistan festivalında (oxtyabr-noyabr) folklor kollektivi ilə bərabər 40 günlük qastrol səfərində olmuşdur.

1989-cu ildə (10-18 iyul) İsveçdə Ümumdünya xalq musiqisi festivalında Xalq artisti Canəli Əkbərov, kaman ustası Elman Bədəlov, tarzən Vamik Məmmədəliyev, qarmon ifaçısı Vaqif Əsədovla birlikdə yüksək səviyyədə qastrol səfərində iştirak edib.

A.Çobanoğlu 1990-1991-ci illərdə Türkiyənin Konya şəhərində keçirilən «Konya Aşıqlar Bayramı»nda Qarslı Aşıq Murad Çobanoğlu ilə yarışmada festivalın baş mükafatına – Atatürk qızıl medalına layiq görülüb. Bundan başqa İsveçrədə və Orta Asiya respublikalarında uğurlu qastrol səfərlərində olmuşdur.

Aşıq Aydın "Günay" ailə ansamblı və "İncəgülü" aşıqlar ansamblı yaratmışdı.

O, 1983-cü ildən Azərbaycan Aşıqlar Birliyin üzvü və Aşıqların IV qurultayının (1984) nümayəndəsi olmuşdur. A.Çobanoğlunun Azərbaycan Aşıqlar Birliyinin yaranmasında xidmətləri olmuşdur. O, ömrünün sonuna qədər Aşıqlar Birliyində Hüseyn Arifin müavini vəzifəsində çalışmışdır.

Bu, təsadüfi deyildi. Aşıq Aydın aşıq sənətini dərindən bilir və ona yaradıcılıqla yanaşırdı. Ona yeniliklər gətirərdi. Yaxşı yadımdadır, o, ADU-nun filologiya fakültəsini bitirəndə görkəmli folklorşünas alim, professor Vaqif Vəliyevin rəhbərliyi ilə «Aşıq Nəcəfin həyat və yaradıcılığı» mövzusunda diplom işi yazmışdı. Diplom işinin müdafiəsində Xalq şairi, professor Bəxtiyar Vahabzadə demişdi:

«Bu diplom işi həcminə və mövzu əhatəsinə görə namizədlik işinə layiqdir. Mövzunun adını dəyiş, «II Dünya müharibəsi illərində Tovuz aşıqları» adlandır və müdafiə et».

Təəssüf ki, ecazkar aşıq sənəti Aşıq Aydını elmdən ayırmış, Bəxtiyar müəllimin arzusu arzu olaraq qalmışdı. Təsəllini onda tapırıq ki, onun qoşmalarını, gəraylılarını, təcnislərini, xarici ölkələrə səfər təəssüratlarını, aşıq sənəti və onun daşıyıcıları haqqında düşüncələrini içinə alan bu zəngin kitabda Aydının diplom işi də yer alır. Filoloq və aşıq Aydın Çobanoğlunun diplom işi ilə tanışlıqdan sonra söz sərrafları akademik Bəxtiyar Vahabzadənin sözlərini bir daha təsdiqləyəcəklər.

İyirmi ildən artıq Nizami adına Ədəbiyyat İnstitutunun Dissertasiya Şurasının üzvü kimi, gənc alimlərin elmi rəhbəri kimi, onlarla doktorluq və namizədlik dissertasiyalarının müdafiəsində rəsmi opponent kimi çıxış edən

tədqiqatçı kimi, Respublikada folklor üzrə Əlaqələndirmə Şurasının sədri kimi tam məsuliyyətlə deyə bilərəm ki, Aydının diplom işi indiki tələbləri nəzərə almaqla, azca əl gəzdirməklə namizədlik dissertasiyaları qarşısında qoyulan tələblərə cavab verir.

Aşıq Aydının «Aşıq sənəti və aşıqlar haqqında düşüncələr» bölümündəki məqalələrini oxuyandan sonra bir daha bu qənaətə gəldim ki, o, bir alim kimi də yetişmişdi. Fikirlərimizi təsdiqə yetirmək üçün onun məqalələrindən bəzisinə nəzər salmağı münasib bildik. Çobanoğlunun «Saz, söz, ifaçılıq və…» adlı məqaləsi elmi və təcrübi cəhətdən əsaslandırılmış dərs vəsaiti səviyyəsindədir. Burada yeni saz havaları, balaban, onun zəruriliyi, mətnin melodiyaya uyğun seçilməsi, aşıq gülləri, aşıq musiqisinin yarıtmaz təbliği, ifaçı və s. yarımbaşlıqlarda qiymətli fikirlər irəli sürülmüşdür. Bu fikirlər günümüzdə də öz aktuallığını itirmir.

Aydının Aşıq Əkbərin «Gənclik» nəşriyyatında çap olunan «İşıqlı tellər» kitabına və Əlimərdanlı Aşıq Nəcəfə həsr etdiyi məqalələri göstərir ki, o, aşıq sənətini dərindən bilən nüfuzlu söz sahibidir.

Çobanoğlu «Sazın Ədalət dünyası» məqaləsində Aşıq Ədalət Nəsibovun 1986-cı ilin oktyabr ayının 2-də Azərbaycan Dövlət Filarmoniyasında keçirilən konsertindən söz açır. Görün konsertdə kimlər olub. Mirzə İbrahimov, İsmayıl Şıxlı, Bayram Bayramov, Bəxtiyar Vahabzadə, Qabil, Vaqif Səmədoğlu, Sabir Rüstəmxanlı, Abbas Abdulla, professorlar Qulu Xəlilov, Teymur Bünyadov, türkiyəli alim İbrahim Bozyel və başqaları. Məclisi gənc şair Zəlimxan Yaqub idarə edirmiş. Belə tarixi faktları haradan əldə etmək olardı? Yaxşı ki, Aydın Çobanoğlu bunları qələmə alıb, bizə yadigar qoyub. Fəxarətlə adlarını sadaladığımız xalqımızın layiqli ziyalıları məclisdə aşıq sənətindən, Ədalət möcüzəsindən söz açmışlar. Aşıq sənətinin inkişafında və təbliğində müstəsna xidmətləri olan Ədalətin ifasında sazın yeni vüsət almasını, bütöv xalqımızın tükənməz sərvətinə çevrilməsini xüsusi vurğulamışdır. Ümumi rəy belə olub ki, Ədalət olan məclisdə ondan əvvəl saz çalmaq günah, ondan sonra saz çalmaq çalğıçı üçün fəlakətdir.

Məncə, bu, Aşıq Ədalətin sənətinə verilən ən ali və dəqiq qiymətdir.

«Sazlı-sözlü nəğməkarlar» məqaləsi ADU-nun tələbəsi Aydın Musayevin ilk qələm təcrübələrindəndir. «Azərbaycan gəncləri» (22.03.1975) qəzetində çıxan bu məqalə Tovuz aşıqlar ansamblının Novruz bayramı günlərində Filarmoniyada verdiyi konsertdən bəhs edir. Məqalədə Əkbər Cəfərov, şəyirdləri Aşıq Əlixan Niftəliyev, Ələsgər Tağıyev və Əskinaz Abbasovadan bəhs edir və Tovuz Aşıq məktəbinin bir səhifəsini yazmış olur.

Aydın Çobanoğlu «Diqqətsizlik, yoxsa…» məqaləsində isə çox aktual bir mövzuya toxunub. Bəzi aşıqların qoşmalarının müxtəlif aşıqların adına çıxılmasından söz açır. Tədqiqatçı faktlarla belə səhvləri göstərir və gələcəkdə belə səhvlərin qarşısının alınması yollarını arayır. Tədqiqatçıları diqqətli olmağa səsləyir.

«Koroğlunun sorağına gəlmişəm» məqaləsindəAşıq Aydın 1988-ci ilin iyun ayında Naxçıvanda Koroğlunun heykəlinin açılışına getməsindən, Babək

rayonunun «Yeni yol» kəndində «Cəlili» və «Ayaq Cəlili» havalarının yaradıcısı, XIX əsrin görkəmli ustadlarından biri Aşıq Cəlilin qəbrini ziyarət etmələrindən, Aşıqlar Birliyinin sədri Hüseyn Arifin Naxçıvanın Mədəniyət naziri Fəttah Heydərovdan aşığın qəbrinin üstünün götürülməsi barədə xahişindən və s. söhbət açır. Bütün bunlar qiymətli məlumatlardır.

Hələ ADU-nun tələbəsi olarkən Aydın «Sovet kəndi» qəzetində (17.04.1976) maraqlı yazı ilə çıxış etmişdi. Məqalədə Tovuz rayonunda Aşıq Əkbərin ideyası və görkəmli maarif xadimi, Tovuz rayon Maarif şöbəsinin müdiri Qara Sultanovun dəstəyi ilə Aşıq Əkbərin doğma kəndi Bozalqanlı kənd məktəbində 1975-ci ilin sentyabrında 18 nəfərdən ibarət Respublikamızda ilk dəfə olaraq saz həvəskarları qrupu yaradılmış, Aşıq Əkbər onlara müəllim təyin olunmuşdu. Tələbə Aydın Musayev nüfuzlu qəzetdə maraqlı məsələ qaldırır. Bu təcrübəni Tovuz rayonunun və eləcə də digər rayonların kənd məktəblərində də yaymaq məsələsini qaldırır. Onun bu arzusu sonralar yerinə yetdi.

Göründüyü kimi, aşıq-şair Aydın Çobanoğlu hələ gənclikdən saz-söz sənəti ilə yaşamış, fikri-zikri bu sənətin inkişaf yollarını aramaq olmuşdur.

Çobanoğlunun aşıq sənəti və ustad aşıqlar haqqında məqalələri, Hindistan və İsveçrə təəssüratları onun səriştəli publisist olmağından xəbər verir.

Aydın, eyni zamanda ilhamlı şair olmuşdur. Təsadüfi deyildir ki, professor Qara Namazov "Aşıqlar" kitabında (2004, s. 54-55) onu oxucu və tədqiqatçılara şair-aşıq kimi təqdim edir.

Onun poeziya sahəsindəki uğurları xüsusi tədqiqat mövzusudur. Aydın Çobanoğlu həm xalq ruhuna daha yaxın olan aşıq poeziyasını, həm də klassik və çağdaş poeziyamızı, yuxarıda qeyd etdiyimiz kimi, yaxşı bilir və hər iki qütbdə qələmini sınayır və uğur qazanırdı.

Aşığın qoşma, gəraylı, təsnif, təcnis, müxəmməslərini, deyişmələrini və s. oxuduqca, onun aşıq yaradıcılığının qaynar çeşməsindən su içdiyinin şahidi oluruq. Onlar kitabda ayrıca bölmədə verilmişdir. Çobanoğlunun mərsiyələri də ayrıca bölmədə verilmişdir. Onun məşhur müğənni Səxavət Məmmədova, Aşıq Şakirə, Salatın Əsgərovaya, dayısı oğlu Yunisə, professor Xital İsmayılova, atası Aşıq Çobana, görkəmli ictimai xadim Yunus Rzayevə və başqalarına həsr etdiyi mərsiyələrini həyəcansız oxumaq olmur. Şair-aşıq Çobanoğlunun nəğmələri də ayrıca bölmədə verilmişdir. Burada «Elmira», «İncəgülü», «Aygünüm», «Gülənə bax, gülənə», «Gülnarə», «Qınama məni, qınama» kimi bulaq suyu kimi qəlbə yayılan şeir-nəğmələri vardır.

Aydın Çobanoğlunun ithafları da ayrıca bölmədə verilmişdir. Aşığın ithaflarını izlədikcə onun çağdaş şairlərimizə, incəsənət nümayəndələrinə, saz-söz ustalarına ehtiram və isti münasibətini aydınca görürük. Xalq şairi Səməd Vurğunun 80 illiyinə, Aşıq Hüseyn Saraçlının 70 illiyinə, Sosialist Əməyi qəhrəmanı Fərzəli Abbasova, şair Sücaətə, İlyas Tapdığa, Xalq artisti Arif Babayevə, professor Teymur Zeynalova, Xalq şairi Söhrab Tahirə, Yunus Novruzoğluna, qarslı Aşıq Murad Çobanoğluna, zəmanənin dönüklüyü ilə vətəndən didərgin düşmüş şair Məmməd İsmayıla, Aşıq Ulduza, şair dostu

Ələmdar İsaya, şair Knyaza, həkim Hökümə Ağayevaya və başqalarına həsr etdiyi şeirlər XX əsrin 70-80-ci illər ədəbi, mədəni və ictimai mühiti barədə təsəvvür yaradır. Şair-aşığın Naxçıvana, Cəlilabada, İsmayıllı kəndlərinə, Kəlbəcərə, Tovuza və s. həsr etdiyi şeirlərini oxuduqca sanki vətən xəritəsini vərəqləyirsən. Belə şeirləri «Çağdaş poeziya nümunələri» başlığı altında vermişik. Kitabda Çobanoğlunun aşıq sənəti və aşıqlar haqqında düşüncələri və səfər qeydləri də ayrıca başlıqla verilmişdir.

Aydın məlahətli səsi olan aşıq idi. Pəsdən oxuyurdu. Taledən gələn qismətini «Veribdi» şeirində minnətdarlıqla yada salır, naşükürlük etmir:

*Çox şükür, yaxşı ki, çıxmayıb yaddan,*
*Bir azca səs, bol söz, bir saz veribdi.*

Çobanoğlu görücü ilə söhbətini ürəkağrısı ilə «Dedim mən» şeirində qələmə alıb:

*Bəxtinə yazılıb cəfa, dedilər*
*Çobanoğlu sürməz səfa, dedilər,*
*Ömrün etməyəcək vəfa, dedilər,*
*Onu həyat özü bilər, dedim mən.*

Doğrudan da aşıq-şairin ömrü vəfa qılmadı. Dahi Səməd Vurğunun dediyi onun da başına gəldi: "Nə ömrə acıyır, nə yaşa dünya".

Elə bu bənddən və eləcə də o vaxt Abşeron rayon İcraiyyə Komitəsinin sədri olmuş Əhməd Əhmədzadəyə ev növbəsi ilə bağlı müraciətindən göründüyü kimi, ömrü bir müddət cəfa çəkməklə, əzab-əziyyətlə keçib. «Ərzi-hal» adlanan şeirdən iki bəndi burada verməyi münasib bildik:

*Az maaşla altı adam dolanır,*
*Yazıq canım oda-közə qalanır.*
*Gözüm baxır, könlüm evi talanır,*
*Ömrüm keçir ahu-zarda, ay sədr.*

*Mənzilsizəm, bu günümü görən yox,*
*Növbədəyəm, əhvalımı bilən yox.*
*Dörd uşaqla kirayə də verən yox,*
*Üz döndərib məndən var da, ay sədr.*

Çox maraqlı, o vaxt üçün məqbul sayılan, bu forma təsiredici gücə malik olsa da, o vaxtlar Bakıda qeydiyyata düşmək, ev növbəsinə yazılmaq, ev almaq ən böyük problem idi. Xoşbəxtlikdən xeyirxah adamlar bütün zamanlarda olub və olacaq. Bir məclisdə Aydın «Yanıq Kərəmi» havasını çalanda özünün və yaşlı adamların gözündən yaş axmağa başlayıb. «Mehdiabad» sovxozunun

direktoru Hidayət Səfərov Aydının vəziyyətindən halı imiş. O, Aydının ailəsinə «Mehdiabad» qəsəbəsində üçotaqlı mənzil vermişdi.

Çobanoğlunun yaradıcılığında ictimai məzmunlu şeirlər çoxluq təşkil edir. Aşıq-şairin «20 yanvar» adlı səkkiz bənddən ibarət şeiri 1990-cı ilin yanvarında xalqımızın başına gətirilən müsibətləri inandırıcı boyalarla açıb göstərir:

*Mən dağam, dözürəm belə sitəmə,*
*Baxıb ah-nalələmə, gözümdə nəmə.*
*Yağı sevinməsin bugünkü qəmə,*
*Yəqin borclu qalmaz sabahım mənim.*

Onun Sosialist Əməyi Qəhrəmanı Fərzalı Abbasova həsr etdiyi iki səhifəlik şeirdə o qədər mətləblərdən söz açılır ki, heyran olmamaq olmur:

*Yurdumun on igid oğulu, qızı,*
*Rəşadət göstərib, qəhrəman olub.*
*Onlardan birindən söhbət açıram,*
*Mənim də ürəyim söz ilə dolub.*

Onun Aşıq Şakirin xatirəsinə həsr etdiyi şeirə fikir verin:

*Çobanoğlu, qoy cavanlar ucalsın,*
*Şah sənətin zirvəsinə yol alsın.*
*Oğlu çalmayıbsa, nəvəsi çalsın,*
*Qoy yetim qalmasın, sazı Şakirin.*

Arzuya baxın. Həqiqətən də böyük sənətkar Aşıq Şakirin övladlarından aşıq sənətinə yiyələnən olmadı. Lakin Aydının arzusu sonralar yerinə yetdi. Şakirin nəvəsi babasının sənətini davam etdirdi. Şakirin sazı yetim qalmadı. Təəssüf ki, Çobanoğlu bunu görmədi.

Aydının bütün arzuları xoş niyyətə köklənmişdi:

*Qazancınız qismət olsun aşığa,*
*Nə həkimə, nə hakimə düşməsin.*

Çobanoğlu qələmini publisistikada sınayaraq çox maraqlı Hindistan və İsveçrə təəssüratlarını yazıb. Eləcə də Hindistana gözəl şeir həsr edib. Lakin bu şeiri yazarkən bir an belə doğma Azərbaycanı unutmayıb:

*Yeni Dehli Bakımızın qardaşı,*
*Qanqa bəlkə Xan Arazın göz yaşı?!*
*Varanəsi Gəncəmizin sirdaşı,*
*Bəyənmişik bu mahalı, gözəldir!*

*Görən kimi doğma, əziz bilmişik*
*Əzəmətli Tac mahalı, gözəldir*!

Çobanoğlunun Yunis Novruzoğluna həsr etdiyi yüz misralıq müxəmməsi və şair Söhrab Tahirə həsr etdiyi «İnanıram» adlı çox geniş həcmli şeiri sanki kiçik poemadır. Aşıq-şairin şeirdə qoyduğu və tərənnüm etdiyi məsələlər onu poema səviyyəsinə qaldırır. Bu şeir Aydının özünün də bir şair kimi səviyyəsindən xəbər verir. Çobanoğlunun «Yunis» adlı müxəmməsi isə onun əsl aşıq-şair olduğuna dəlalət edir:

*Tək gəlib, tək gedəcək,*
*Bunu hamı bilsin gərək.*
*Müxtəsəri, Çobanoğlu,*
*Əvəzsiz insandı, Yunis!*

Aydın Çobanoğlunun mənasız bir misrasına belə təsadüf edilmir. İstisuda (22.07.1984) Məmməd İsmayıla həsr etdiyi şeiri çox mətləblərdən söz açır:

*Şair qardaş, gəl bürünək dumana,*
*Seyrə çıxaq, bu dağlara doyunca.*
*Məbəd kimi diz qatlayaq önündə,*
*Səcdə qılaq bulaqlara doyunca.*

İnanıram ki, Aydının oğlu, qızları, nəvələri, xüsusən də kəlbəcərli dostu Vəliyəddin İsmayılovun sevimli oğlu İlqarla ailə quran Aytənin övladlarına onun arzusunu yerinə yetirmək qismət olacaqdır.

Yeri gəlmişkən, Məmməd İsmayıl başda olmaqla, Aydın Çobanoğlu yaradıcılığına saz-söz sənətini dərindən bilən bir çox qələm sahibləri, alimlər məqalələr həsr etmişlər. Aşıq sənətinin təbliğində xidmətləri olan Xalq şairi Zəlimxan Yaqubun, professorlar Qara Namazovun, Sədnik Paşayevin, Məmməd Aslanın, Ağalar Mirzənin, Telli Pənahqızının, Əli Şamilin, Vəliyəddin İsmayılovun, Osman Əhmədoğlunun məqalələrinin elmi səviyyəsini xüsusi vurğulamaq istərdim. Heyif ki, aşıq Aydın sıralarımızı çox erkən tərk etdi. Nə yaxşı ki, sağlığında – 1991-ci il fevralın 10-da anadan olmasının 40 illiyini yüksək səviyyədə keçirdik. Tədbir «Gülüstan» sarayının banket zalında baş tutdu. Tovuzdan Aydının anası da gəlmişdi. Məclisi aparmaq mənə həvalə olunmuşdu. Aşıq Aydının anası, dostları və qohumları qarşısında hesabatına çevrilən məclis dahi bəstəkar Üzeyir Hacıbəylinin «Koroğlu» operasının uvertürası ilə başladı. Hamımız ayağa qalxaraq əl-ələ verdik və əllərimizi yuxarı qaldırdıq. O ağır vaxtlarda bir çox toylarımız da «Koroğlu»nun uvertürası ilə başlayırdı. Hamı ayayğa qalxıb əl-ələ tutardı. Bu, vətənpərvərlik hisslərinin artmasına, milli birliyə çox kömək edirdi. Təəssüf ki, sonralar bu gözəl adət unuduldu.

Qeyd edim ki, Aydının yubileyinə dostu, sevimli müğənnimiz Səxavət Məmmədov da xanəndə və çalançılarla təşrif buyurmuşdu. Beş saatdan artıq davam edən, iki video kasetə zorla sığan (Həmin kasetləri əziz xatirə tək indi də saxlayıram) tədbirdə iştirak edən, Aydın haqqında söz deyən dəyərli insanları göz özünə gətirdikcə indinin özündə belə ürəyim qürurla döyünür.

Xalq şairi Zəlimxan Yaqub, professorlardan Teymur Zeynalov, İbrahim İsayev, Dəmir Qənbərov, Aydının oğlu Səyyadın kirvəsi Faiq Həsənov, Qənbər Hüseynov, Telli Pənahqızı və başqaları Çobanoğlunun uğurlarından və ulu ozan-aşıq sənətinə verdiyi töhfələrdən söz açdılar. Aşıq Aydın hamını haldan-hala salan, yandırıb-yaxan «Yanıq Kərəmi»ni çalanda Zəlimxan Yaqub 2-ci dəfə odlu-alovlu çıxış etdi. Zəlimxan birinci dəfə eşitdiyimiz «Varıymış» qoşmasını oxuyanda məclis təlatümə gəldi:

*Qonaq oldum Tovuz adlı mahala,*
*Hər sinədə min bayatı varıymış.*
*İndi bildim bu torpaqda ellərin,*
*Nə dövranı, nə həyatı varıymış.*

Aydının övladları Aygün və Səyyadın oxuduqları aşıq havaları da hərarətlə qarşılandı. Kaş o günlər olaydı…

Qısa zaman kəsiyində Səxavət Məmmədov, İbrahim İsayev, Dəmir Qənbərov, Qənbər Hüseynov və Aydın Çobanoğlu kimi dəyərli insanları itirmişik. Zəlimxan kimi istedad sahibi, Xalq şairi xəstəliyə mübtəla olub. Aydın kimi Universitet təhsilli bir aşığın aramızdan erkən getməsi aşıq sənəti üçün itkidir. Təəssüflənirəm ki, hamının dostu olan, dostlarının sayı-hesabı bilinməyən bir dostu çox tez itirdik. Təsəllini onda tapırıq ki, dostları onu unutmur.

Aşıq Aydının dostlarından biri də saz-söz sənətini yüksək qiymətləndirən, bir çox el şairlərinin, aşıqların kitablarının çapına dayaq olan, ürəyi xeyirxahlıqla döyünən Namazəli Məmmədovdur. Onun sayəsində işıq üzü görən «Ömrün etməyəcək vəfa dedilər» kitabını Çobanoğlu sənətinin pərəstişkarlarına töhfə etməkdən məmnunluq duyuram.



**Araz YAQUBOĞLU**
*tədqiqatçı*

# ŞAİR HÜSEYN MAYIL, YOXSA AŞIQ HÜSEYN MAYIL

Hüseyn Paşa oğlu Hüseynov 1900-cü ildə Qazax qəzasının Göyərçin kəndində tanınmış "Paşalar" nəslində anadan olmuşdur. Deyilənlərə görə bir vaxtlar bu nəslin ulu babaları Təbrizin qədim Dəvəçilər məhəlləsində yaşamışlar. Qazağa gələn nəslin bir qolu da Tovuzda və Gədəbəydə yaşayır.

Hüseyn ilk təhsilini mədrəsədə aldıqdan sonra Dilicanda Pedaqoji Seminariyanı qurtarmışdır. Uzun zaman Qazax, Tovuz və Gədəbəyin müxtəlif kəndlərində müəllimlik etmiş, müəllimliklə bərabər, qəzet redaksiyalarında da çalışmışdır. O, eyni zamanda 1930-cu illərdə əlifbanın dəyişməsi ilə əlaqədar yeni lüğətin hazırlanmasında da yaxından iştirak etmişdir.

Araşdırmalarımız zamanı məlum oldu ki, Hüseynin şeirləri Sanı və Mayıl təxəllüsü ilə 1925-ci ildən qəzetlərdə və kitablarda nəşr olunmağa başlamışdır.

1930-cu ildə nəşr olunmuş "Azərbaycan aşıqları" kitabında şairin 11 qoşması və 3 gəraylısı çap edilmişdir.[2] Kitabda çap olunan şeirlərdən "Yatıb, oyanmaz-oyanmaz" rədifli gəraylı və "Gözəlim", "Görünür", "Görəydim", "Gözəl" rədifli qoşmalar sonrakı digər çaplarda yoxdur. 1938-ci ildə çap olunan "Aşıqlar" kitabında isə şairin 40 qoşması, 14 gəraylısı və 2 müxəmməsi olmaqla 56 şeiri çap olunmuşdur.[3]

1984-cü ildə nəşr edilən "Azərbaycan aşıqları və el şairləri" kitabının II cildində el şairinin şeirləri çap olunmuşdur. Belə ki, onun kitabda 23

[2] "Azərbaycan aşıqları", II cild. (toplayanı: Hümmət Əlizadə). Bakı, "Azərnəşr", 1930. səh.225-234.
[3] "Aşıqlar", (toplayanı: Hümmət Əlizadə). Bakı, "Azərnəşr", 1938. səh.240-288.

qoşması, 8 gəraylısı və 2 müxəmməsi olmaqla 33 şeiri oxuculara təqdim edilmişdir.[4]



2005-ci ildə "Azərbaycan aşıq şeirindən seçmələr" kitabında müəllifin 23 qoşması, 8 gəraylısı və 2 müxəmməsi olmaqla 33 şeiri çap olunmuşdur.[5] Bu çapda 1984-cü ildə çap olunan şeirlər eynilə təkrar, 1938-ci ildəki çap olunan 56 şeirdən 23 şeir az olmaqla yenə də eyni şeirlər nəşr olunmuşdur.

Şairin həyat və yaradıcılığının daha dolğun çap olunan - 2008-ci ildə nəşr edilmiş "Qoşa qəlbin duyğuları" kitabında isə müəllifə məxsus 39 qoşma, 11 gəraylı və 3 müxəmməs olmaqla 53 şeir çap olunmuşdur.[6] Bu kitabda isə əvvəlki çaplardakı şeirlərdən 16 şeir çap olunmamışdır. Lakin bu kitabda heç vaxt çap olunmayan 11 qoşma və 2 müxəmməs çap olunmuşdur.

Şairin şeirləri türk tədqiqatçılarının da marağına səbəb olmuşdur. Belə ki, onun 1984-cü il çapındakı şeirləri bütünlüklə Türkiyə türkcəsinə uyğunlaşdırılaraq internetdə yerləşdirilmişdir.[7] Yeri gəlmişkən onu da qeyd etmək lazımdır ki, Hüseyn Mayılın həyat və yaradıcılığı ilə maraqlananlar açıq ensiklopediya olan www.az.wikipedia.org internet saytında da tanış ola bilərlər (məlumatlar bu sətirlərin müəllifi tərəfindən yerləşdirilib).

Araşdırmalarımızdan belə nəticəyə gəlirik ki, şair Hüseyn Mayılın 55 qoşması, 15 gəraylısı və 4 müxəmməsi olmaqla bizə məlum olan cəmi 74 şeiri vardır.

Şairin adı Hüseyn, soyadı Hüseynov, təxəllüsü isə əvvəldə də qeyd etdiyimiz kimi, Sanı və Mayıl olmuşdur. Araşdırmalarımız zamanı o da məlum oldu ki, bəzi kitablarda səhvən Aşıq Hüseyn Mayıl kimi təqdim olunmuşdur. Aşağıdakı nəşrlərdəki adlara diqqət yetirək:

1930-cu ildə "Azərbaycan aşıqları" kitabında "Hüseyn Sanı", 1938-ci ildə çap olunan "Aşıqlar" kitabında "Hüseyn", 1984-cü ildə nəşr edilən "Azərbaycan aşıqları və el şairləri" kitabının II cildində "Aşıq Hüseyn Mayıl", 2005-ci ildə "Azərbaycan aşıq şeirindən seçmələr" kitabında

---

[4] "Azərbaycan aşıqları və el şairləri", II cilddə. II cild. (tərtib edəni: Əhliman Axundov), Bakı, "Elm", 1984. səh. 273-294.

[5] "Azərbaycan aşıq şeirindən seçmələr". II cilddə. II cild. Bakı, "Şərq-Qərb", 2005. (tərtib edənlər: Əhliman Axundov, İsrafil Abbaslı, Hüseyn İsmayılov) səh.235-257.

[6] Hüseyn Hüseynov, Tofiq Hüseynov. "Qoşa qəlbin duyğuları", Bakı, "Təbib", 2008. səh.3-75.

[7]

"Aşıq Hüseyn Mayıl", 2008-ci ildə nəşr edilmiş "Qoşa qəlbin duyğuları" kitabında "Hüseyn Hüseynov". Göründüyü kimi 1984-cü ildəki səhvi 2005-ci ildəki çapda da təkrar ediblər.

Lakin araşdırmalarımız nəticəsində məlum oldu ki, o, heç vaxt əlinə saz alıb el məclisləri keçirməmişdir. Sadəcə olaraq şeirlərini aşıq şeiri üslubunda yazmış və sazın vurğunu olmuşdur.

Bir məsələdən də yan keçmək mümkün deyildir. Bu, şairin tərcümeyi-halı ilə bağlıdır. 1930-cu ildə nəşr olunmuş "Azərbaycan aşıqları" kitabında Hümmət Əlizadə yazır: "Hüseyn Sanı, Dilican dairəsi Göyərçinli kəndində 1909-cu ildə doğulmuşdur. İbtidai təhsilini mədrəsədə almışdır. Onun yaşadığı güllü-çiçəkli və saf havalı dağ həyatı olmuş və bu həyat onda şairliyə həvəs oyatmış, gənc yaşında el arasında tanınmış, hər kəs tərəfindən gözəl qoşmaları mənimsənmişdir.

Hüseyn Sanı hələ də kənd müəllimi olmaqla bərabər yeniliyə aid bir çox şeir parçaları söyləmiş və hələ də söyləməkdədir."[8] Bu kitabdan 54 il sonra çap olunan "Azərbaycan aşıqları və el şairləri" kitabının II cildində isə tərtibçi Əhliman Axundovun qeydini oxuyaq: "Şeirlərindən Qazax və Tovuz tərəfdə yaşadığı təxmin edilən Aşıq Hüseyn Mayılın həyatı barədə əlimizdə dəqiq məlumat yoxdur. Əsərlərindən bəlli olur ki, o, həqiqi sənətkar, ustad aşıq imiş. Rəvan təbi, yaxşı saz çalmağı ilə tanınmışdı."[9]

Bizə elə gəlir ki, Əhliman Axundova 1930-cu ildə çap olunan kitab məlum olmamış deyildi. Onda görəsən bəs nəyə görə şair haqqında belə bəsit məlumatla yanaşı hətta şairi də aşıq kimi oxuculara təqdim etmişdir.

Eldar İsmayılın oçerklərinin birində Hüseyn Mayıl haqqında oxuyuruq: "Dahi şairimiz Səməd Vurğun və tanınmış folklorşünas alim Hümmət Əlizadə ilə birlikdə Çəmbərəyi və Göyçəni kəndbəkənd gəzmiş, ağsaqqallardan bayatı və nağıl bilicilərindən bildiklərini öyrənərək onları xalqın ümumi istifadəsinə vermişlər".[10]

Bu sətirlərin müəllifi şəxsən el şairi Hüseyn Mayılın oğlu Tofiq Hüseynovla görüşmüşdür. Görüşdə məlum olmuşdur ki, bəli, həqiqətən də Səməd Vurğun, Hümmət Əlizadə, Şeyda Əziz, Aşıq Əsəd, Miskin Əli və başqaları ilə el şairi çox yaxın dostluq etmişdir. Bu dostların təxəllüslərində də bir doğmalıq, bir eynilik vardır. Belə ki, Vurğun, Şeyda və Mayıl sözlərinin mənası vurulmaq, valeh olmaq anlamına gəlir.

---

[8] "Azərbaycan aşıqları", II cild. (toplayanı: Hümmət Əlizadə). Bakı, "Azərnəşr", 1930. səh.225.

[9] "Azərbaycan aşıqları və el şairləri", II cilddə. II cild. (tərtib edəni: Əhliman Axundov), Bakı, "Elm", 1984. səh. 272.

[10] Eldar İsmayıl. "Oğuz yurdun övladları", Bakı, "Təbib", 1999. səh.285.

Hətta Şeyda Əziz 1957-ci ildə vəfat edərkən şair onun ölümünə "Heyif oldu" adlı şeir də yazmışdır.

Nümunəvi ailə başçısı kimi 5 oğul, 3 qız böyüdən, Qaraqoyunlu mahalında və ümumən Qazax qəzasında "Əməkdar müəllim" kimi tanınan "Şərəf nişanı" ordenli, şair Hüseyn Mayıl 1970-ci il fevralın 20-də Qərbi Azərbaycanın Dilican rayonunun Salah kəndində vəfat etmiş və həmin kəndin qəbiristanlığında dəfn olunmuşdur.

El şairinin şeirlərini oxuyarkən bir növ oxucuya elə gəlir ki, Aşıq Alını, Aşıq Ələsgəri, Səməd Vurğunu oxuyur. O da özündən əvvəlki adıçəkilən sələfləri kimi, xalq dilində o qədər şirin və oxunaqlı, yaddaqalan yazıb ki, şeirlər hətta bir dəfə mütailədən belə yadda qalır, dildə əzbərə çevirilir. Şairin şeirlərində özündən əvvəlki şair və aşıqların şeirləri ilə mövzu baxımından uyğunluq təşkil edənləri də var. Onun "Zinyət" adlı qoşması ilə Aşıq Ələsgərin "Gülpəri!" adlı qoşmasına nəzər yetirsək dediklərimiz aydın olacaqdır.

**Aşıq Ələsgər:**

*Tanrı səni qüdrətindən yaradıb,*
*Gözəlliyinə yox bəhana, Gülpəri!*
*Dodaqların batıb bala, qaymağa,*
*Qənd əzilib dil-dəhana, Gülpəri!*[11]

**Hüseyn Mayıl:**

*Qafqaz gözəlisən, ölkə maralı,*
*Sədan düşüb, bütün cahana, Zinyət.*
*Şəkərsən, təhdisən, qiymətli cansan*
*Şirinlik verirsən dahana, Zinyət.*[12]

Hüseyn Mayılın yaradıcılığında gözəlləmələr daha çox üstünlük təşkil edir. Burada zənnimizcə öncədən də dediyimiz kimi, Ələsgər məktəbinin rolu danılmaz faktdır. El şairinin "Xırdaca qız", "Həcər", "Nərgizim", "Zinyət", "Sarı qız", "Səlmi", "Sənəmim", "Telli", "Mehri", "Zəhrə", "Güllünün" və başqa şeirləri dediklərimizə əyani misaldır. "Xırdaca qız" adlı müxəmməsə, bildiyimiz kimi, Aşıq Ələsgər və Aşıq

[11] Aşıq Ələsgər (Əsərləri, dastan-rəvayətlər, xatirələr...). Bakı, "Şərq-Qərb", 1999, səh.91.
[12] Hüseyn Hüseynov, Tofiq Hüseynov. "Qoşa qəlbin duyğuları", Bakı, "Təbib", 2008. səh.18.

Əsəd yaradıcılığında da rast gəlinir. Şairin "Yatıb, oyanmaz-oyanmaz" rədifli gəraylısı XIX əsrdə yaşamış Daşkəndli Şair Məmmədhüseynin məşhur eyniadlı gəraylısına nəzirədir.

Şairin ayrı-ayrı şeirləri kifayət qədər müxtəlif kitablarda çap olunub, haqqında bir neçə məqalələr yazılsa da, onun şeirlərinin tam toplu şəklində çap olunması məqsədəuyğun və vacibdir. Onun aşıq şeiri üslubunda yazdığı şeirlərinin Azərbaycan ədəbiyyatının zənginləşməsində rolu böyük və danılmazdır həqiqətdir.

## İstifadə edilmiş ədəbiyyat:

**1.** Hüseyn Hüseynov, Tofiq Hüseynov. "Qoşa qəlbin duyğuları", Bakı, "Təbib", 2008.
**2.** "Azərbaycan aşıq şeirindən seçmələr". II cilddə. II cild. (tərtib edənlər: Əhliman Axundov, İsrafil Abbaslı, Hüseyn İsmayılov), Bakı, "Şərq-Qərb", 2005.
**3.** "Aşıqlar", (toplayanı: Hümmət Əlizadə). Bakı, "Azərnəşr", 1938.
**4.** "Azərbaycan aşıqları", II cild. (toplayanı: Hümmət Əlizadə). Bakı, "Azərnəşr", 1930.
**5.** Eldar İsmayıl. "Oğuz yurdunun övladları", Bakı, "Təbib", 1999.
**6.** Aşıq Ələsgər (Əsərləri, dastan-rəvayətlər, xatirələr...). Bakı, "Şərq-Qərb", 1999.
**7.** "Ədəbi İrəvan-2008" (Almanax), **(**toplayıb tərtib edəni: Əli Vəkil), Bakı, "Nurlan", 2009.
**8.** "Ədəbi İrəvan-2009" (Almanax), **(**toplayıb tərtib edəni: Əli Vəkil), Bakı, "Nurlan", 2009.
**9.** "Azərbaycan aşıqları və el şairləri", II cilddə. II cild. (tərtib edəni: Əhliman Axundov), Bakı, "Elm", 1984.



# BİZƏ YAZIRLAR...

2012-ci ilin payızında "Ustad aşıqlarımız" seriyasından tərtib edib nəşrə hazırladığımız **"Aşıq Ələsgər"** (Bakı, "Elm və təhsil", 2012. 280 səh.) kitabı işıq üzü görəndən sonra geniş oxucu kütləsindən, folklorşünaslardan redaksiyamıza çoxlu sayda məktub daxil olmaqdadır. Xatırladırıq ki, kitabda son illərdə Aşıq Ələsgərə həsr olunmuş elmi-publisistik məqalələr, bu böyük ustada ithaf olunmuş şeirlər və özünün yaradıcılığından seçmələr yer alıb. Aşıq Ələsgər elə bir böyük sənətkardır ki, indiyədək yaradıcılığına onlarla dissertasiyalar həsr olunub, haqqında monoqrafiyalar yazılsa da, bu gün də folklorşünas alimlərimizin əsas tədqiqat obyekti olaraq qalır. Və təbii ki, onun haqqında yazılan məqalələrin, ona ünvanlanmış şeirlərin hamısını bir kitabda toplamaq mümkünsüz idi. Elə bizə müraciət edən oxucularımızın bir qismi də diqqəti məhz bu cəhətə yönəldərək Aşıq Ələsgərlə bağlı müəyyən səbəblərdən adıçəkilən kitaba düşməyən yeni-yeni məqalə və şeirləri bizə göndərirlər. Belə məktublardan birini də bu günlərdə "Ozan dünyası" jurnalının sədaqətli oxucularından olan və maraqlı məqalələri ilə jurnalımızın səhifələrində tez-tez çıxış edən gənc tədqiqatçı **Araz Yaquboğlundan** almışıq. O, yazır:

*"Hörmətli Musa müəllim!*

*Sizin nəşrə hazırladığınız, Azərbaycan Aşıqlar Birliyinin təşkilatçılığı və Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının maliyyə dəstəyi ilə çap olunan "Ustad aşıqlarımız" seriyasından "Aşıq Ələsgər" kitabını böyük həvəslə oxudum. Və açığı deyim ki, çox sevindim. Həm də ona görə sevindim ki, 2008-ci ildə Azərbaycan Aşıqlarının V Qurultayının keçirilməsi və həmin qurultayda Xalq şairi Zəlimxan Yaqubun Azərbaycan Aşıqlar Birliyinin sədri vəzifəsinə seçilməsindən sonra Birliyin fəaliyyətindəki canlanma, həyata keçirilən məqsədyönlü tədbirlər danılmaz faktdır. Sirr deyil ki, ötən əsrin 90-cı illərinin əvvəllərindən aşıqların V qurultayının keçirilməsinə qədər olan dövrdə bu birliyin fəaliyyəti yox dərəcəsində idi. Aşıqlara ögey münasibət hətta aşıq olanın da aşıqlığını danmağa gətirib çıxarmışdı.*

*Sonda onu da qeyd etmək istəyirəm ki, Zəlimxan Yaqubun "Göyçədən gələn səslər" poeması kitabı daha da oxunaqlı edir".*

Hörmətli Araz Yaquboğluna təşəkkür edir və məktubla birlikdə göndərdiyi Aşıq Ələsgərə ithaf olunmuş şeirləri oxucularımza təqdim edirik.

**Musa Nəbioğlu**

**Həsən XƏYALLI**

## *ƏLƏSGƏR*

Sən oldun dünyada söz ümmanının
Əşrəfi, incisi, ləli, Ələsgər.
Götür telli sazı Səhnabanının
Ayağı altında ləli, Ələsgər.

Ey sənət ustadı, ey söz ustadı,
Sən qaldırdın zirvələrə bu adı!
Dost bildin qohumu, dost bildin yadı,
Üzmədin ətəkdən əli, Ələsgər.

Səni dahi bildi bütün bəndələr,
Aşıqlar, şairlər, həm xanəndələr,
Baxdı kamalına yüz danəndələr,
Dedi kamalına bəli, Ələsgər.

Arif məclisində dedin bir xanə,
Hər ürəkdən qala yapdın bir xana.
Baş əymədin bir ağaya, bir xana,
Dedin adlarına zəli, Ələsgər.

Mərdlər meydanında sən oldun ulu,
Aradın, axtardın həqiqət yolu.
Dost bildin özünə lütü, yoxsulu,
O, fəqir, füqara eli, Ələsgər.

Hacılara nökər oldu əzəlin,
Dedin, könül, bu sənətdən üz əlin.
Şahmara bənzətdin oğrun gözəlin
Hörüb, bağladığı teli, Ələsgər.

Yüz yol dedin: a nanəcib, a nadan,
Mərd oğul tək halal süd əm anadan.
Yad oldu könlünə əzəl binadan,
Koyxaların gəlhagəli, Ələsgər.

Kim yıxılsa, yetdin onun dadına,
Pərvanə tək yandın elin oduna,
Xəsislərin, acgözlərin adına,
Dastan yazdın nə gülməli, Ələsgər.

Həcv yazdın, şahlar qəlbin dağladın,
Dar ayaqda qürurunu saxladın,
Azad, xoşbəxt bu həyata bağladın,
Ağır ayı, ağır ili, Ələsgər.

Dövr edirsən ürəklərin qanında,
Hər ömürün dəyqəsində, anında.
Xəyallıyam, qanan, sərraf yanında,
Min il keçsə, vəsfin qalı, Ələsgər.

**Qəmgin FƏZİ**

## SƏNDƏDİ

***Ustad Aşıq Ələsgərə***

Ustadlar ustadı, Ələsgər baba,
Elmi-dürdü, gövhər-kanı səndədi.
Təcnisin, qoşmanın şəhdi-şəkəri,
Müxəmməsin hər mədəni səndədi.

Yetimin, yesirin gözünün nəmi,
Fələyin çəkilməz kədəri, qəmi,
Koyxanın, katdanın zülmü, sitəmi,
Fağırın, yoxsulun ünü səndədi.

Baş əyir həmişə Fəzi ustada,
Həqiqət kəlmənə can eylər fəda.
Neçə ki, var adın, yaşar dünyada,
Könüllərin hər dərmanı səndədi.

**Xasay ZEYNALOV**

**ƏLƏSGƏR BABA**

Kamil sərraf qiymət verib yerində
Hikmətdə üzübdü Ələsgər baba.
Mərifət elmindən, din aləmindən,
Gör nələr yazıbdı Ələsgər baba.

Qoşmada, qəzəldə, təcnislərində,
Divani, müxəmməs, təxmislərində,
Gəraylı, cığalı təcnislərində
İncilər düzübdü Ələsgər baba.

Yaradan yaradıb onu hünərmənd,
Təcnislərə bəzək verir cığa, bənd.
Açıb neçə-neçə bağlı qıfılbənd,
Ələyib, süzübdü Ələsgər baba.

Deyibdi, bələdəm hər elmə baş-baş,
Nəcəfi, Əsədi edibdi sirdaş,
Pirə ata deyib, cavana qardaş,
Yaxşı dost gəzibdi Ələsgər baba.

Neçə dəfə zərbə dəyib Göyçəmə,
Sinə gərib, dözüb zülmə, sitəmə.
Taleyinə gələn kədərə, qəmə
Mərdliklə dözübdü Ələsgər baba.

Axtarıb dərini, gəzib dayazı,
İnsana zövq verib gözəl avazı.
Deyirlər solaxey çalıbdı sazı,
Oxuyub, süzübdü Ələsgər baba.

Xasay, söylə könül açan avazda,
Yetmiş iki hava çalıbdı sazda,
El-oba içində, qoca Qafqazda
Hörmətlə gəzibdi Ələsgər baba.

**Coşqun AĞABABA**

## ƏLƏSGƏR

İşıq saldın hər ölkəyə, mahala,
Şöhrət oldun bizim elə, Ələsgər.
Sədəfli sazını alanda ələ,
Döndün bir ümmana, selə, Ələsgər.

Hər mahalda məclis qurub gəzibsən,
Mirvari sözləri bir-bir düzübsən,
Elmin dəryasında kamil üzübsən,
Uymadın fitnəyə, felə, Ələsgər.

Təcnisin, divanin aldı dünyanı,
Bütün aləm yanır Ələsgər hanı.
Ağababayam, budur sözümün canı,
Düşübsən dillərdən-dilə, Ələsgər.

**Əlixan QƏHRƏMANOV**

## ƏLƏSGƏR

Sən anadan olan gündən sanasaq,
Yüz əlli il tamam oldu, Ələsgər.
Qoşman, təcnislərin, dodaqdəyməzin,
Hər birisi, bir dərs oldu, Ələsgər.

Yad etdin həmişə sən ustadları,
Aşıq Alı kimi bir sənətkarı.
Min cürə gül açdı bağçanın barı,
Heyif ki, gül təki soldun, Ələsgər.

Yandırdın şeirdə sönməyən çıraq,
Əlixan hikmətindən qoy versin soraq.
Söz qoşdun, dodağa dəymədi dodaq,
Ustadlar ustadı oldun, Ələsgər.

**İbrahim KÖÇKÜN**

## ƏLƏSGƏR

Zirvədə qaynayan büllur bulaqsan,
Suyun şəlalədi, seldi, Ələsgər.
İstədim baş vurub keçəm o taya,
Gördüm ki, dəryadı, göldü Ələsgər.

Çağladı sinəndə söz yavaş-yavaş,
Qələmin saz oldu, dəftərin yaddaş.
Yayıldı ellərə, saldı bir təlaş,
Gördülər gövhərdi, ləldi Ələsgər.

Yüz beş il dünyanın seyrinə daldın,
Dərsini xudadan pünhanca aldın.
Sözdən qala qurdun, ərşə ucaldın,
Dünya ziyarətə gəldi, Ələsgər.

Dəryalardan inci, zirvədə çiçək,
Toplayıb möcüzə yaratdın gerçək.
Alim, üləma yox, bir peyğəmbərtək
Ərşin-gürşün sirrin bildin, Ələsgər.

Dostun Mirzə Bəylər varmı yanında?
Cənnətməkandırmı ruhu onun da?
Cütmü gəzirsiniz mələk donunda?
Köçkün ruhunuza quldu, Ələsgər.

**Ziyəddin MƏHƏRRƏMOV**

## ƏLƏSGƏR

Sənət aləminin Dədə Ustadı,
Göyçənin şöhrəti sənsən, Ələsgər!
Şairi, aşığı səf-səf düzülsə,
Onların hörməti sənsən, Ələsgər!

Əzbərdir dillərdə ünvanın, sözün,
Ozan sənətində öz yolun, izin.

İkiyə bölünən bu ölkəmizin
Tükənməz sərvəti sənsən, Ələsgər!

Elə bir dahisən, yoxdur bənzərin,
Hikmətdən yoğrulub adi sözlərin.
İsnad verənisən xoşbəxt günlərin,
Bu xalqa şan-şöhrət sənsən, Ələsgər!

Dilindən düşmədi gözəl, yar adı,
Dedin: huri Telli, mələk qonçadı.
Qız-gəlinin bildin doğmanı, yadı…
Saxlayan isməti sənsən, Ələsgər!

Dastanlaşan qoşmaların, təcnisin,
Xoşa gələn hər dövranın, gərdişin,
Tarixləşən kəlamların, məclisin,
Sevdirən milləti sənsən, Ələsgər!

**Müzahim MEHBALIOĞLU**

## ƏLƏSGƏR

O insanın söz dünyası,
Bütün dillərdə əzbərdir.
Hər misrası, hər bir beyti
Əbədilik bir heykəldir.

O, sənətdə birdi hələ,
Açılmamış sirdi hələ,
Həm ocaqdı, pirdi hələ,
İncidi, gövhərdir, zərdir.

O, zirvədi Müzahimə,
Bənzətməz onu heç kimə.
Söz toxuyub ilmə-ilmə,
Adı ustad Ələsgərdir.

Tofiq ABDULLAYEV



# GETMƏZ QULAQLARDAN SƏSİ ŞAKİRİN

Aşıq Şakirin sənət zirvəsində durduğu vaxtlar yaşıma görə mənim sənəti, ifaçılığı, xüsusilə də Aşıq Şakirin oxumalarını dərindən duyub, hiss elədiyim çağlara düşürdü. Odur ki, o zaman Aşıq Şakir sənətindən çox böyük zövq almışam, o gözəl ifalar ta o vaxtlardan canıma, qanıma hopub.

Bu, məndən asılı deyil. Aşıq Şakirin, onun kimi ustadların oxumalarını eşitdiyimə görədir ki, indi hər oxuyan mənim qəlbimə, hisslərimə təsir edə bilmir, məndə heç bir təəccüb oyatmır. Mən Aşıq Şakiri dəfələrlə toylarda, məclislərdə, el şənliklərində, məhsul bayramlarında görmüşəm. Ona olan böyük hörmət və ehtiramın şahidi olmuşam. Aşıq Şakirin səsi də, görkəmi də gözəl idi. Sözün əsl mənasında məclislər yaraşığı idi Aşıq Şakir.

Aşıq Şakirin böyüklüyünü, sənətinin əzəmətini onun haqqında kitab yazarkən söhbətləşdiyim bir çox tanınmış sənətkarların unudulmaz xatirələri timsalında bir daha yaxından hiss etdim.

O vaxt görkəmli aşıq və xanəndələr, müğənnilər Filarmoniya bağında, Vahid Poeziya evinin həndəvərində yığışardılar. İş elə gətirdi ki, xalq artistləri – Habil Əliyev, Əlibaba Məmmədov, Arif Babayev və İslam Rzayevi bir yerdə görə bildim. Aşıq Şakirin adı çəkiləndə hamının xəyalı ötən illərə, Şakirli çağlara kökləndi. Söhbətimiz dəyirmi stola bənzədi. Aşıq Şakir haqqında xatirə söyləyən bu sənətkarların səsini lentə aldım. Bu səslər həmin andan tarixə çevrildi. Sənətkarlar danışdıqca kövrəlir, Aşıq Şakir itkisindən sarsıldıqlarını bildirirdilər.

Habil Əliyev söhbətini göz yaşları ilə tamamladı. Dedi: “Bir onu bilirəm ki, xalq Aşıq Şakirdən doymadı”...

Əlibaba Məmmədov dedi: "Şakirdən gəlməyib, gəlməyəcək. Mən eşidəndə ki, Aşıq Şakir Bakının filan kəndinə toya gəlib, o gün nə vacib işim vardısa qoyurdum bir kənara. Ətrafıma beş-on nəfər toplayıb gedirdik Aşıq Şakirə qulaq asmağa. Aşıq Şakir mənə deyirdi: "Əlibaba müəllim, gəl məclisin yuxarı başında əyləş, özün də oxu, camaatı feyziyab elə". Deyirdim, ustad, mən bura oxumağa gəlməmişəm, sənə qulaq asmağa, səndən zövq almağa gəlmişəm".

İslam Rzayev Aşıq Şakirin vurğunu olduğunu bildirdi. Dedi ki, Filarmoniyada keçirilən konsertlərin birində tamaşaçılar Aşıq Şakiri sürəkli alqışlarla dalbadal 7 dəfə səhnəyə çağırdılar. Yenə çağırmaq istəyəndə konsertin aparıcısı səhnəyə çıxaraq salona üz tutub yalvarıcı tərzdə dedi: "Siz Allah, insafınız olsun. Onun da halını nəzərə alın da..."

Aşıq Şakirlə əlaqədar bəstəkar Vasif Adıgözəlovla da görüşmüşdüm. Vasif müəllimin dediklərindən: "Atam Zülfü Aşıq Şakirin vurğunu idi. Onun mahnıları radiodan səslənəndə çox maraqla qulaq asırdı. Deyirdi: "Şakirdən olmaz. Allah-taala bu adama nə qədər gözəl səs verib"..."

Vasif müəllim bir xatirə də danışdı: "Mən o vaxt Filarmoniyada şöbə müdiri işləyirdim. Bəzən elə olurdu ki, plan dolmurdu, işçilərə əməkhaqqı verə bilmirdik. Bunun çıxış yolunu tapmışdıq. Maliyyə çətinliyi-filan olanda Aşıq Şakiri çağırırdıq Bakıya, beş günlə, on günlə Filarmoniyada onun konsertini təşkil edirdik. Bir də görürdük ki, plan 200-250 faiz dolub. Şakir bizi çətinlikdən belə çıxarırdı".

Aşıq Ədalət Nəsibovla söhbət edəndə dedi: "Şakirə bərabər sənətkar yox idi. Mən o kişinin çörəyini yemişəm. Mənim boynumda onun çox haqqı-sayı var".

Mən bu məqalədə dörd böyük sənətkarın – Habil Əliyevin, Əlibaba Məmmədovun, Aşıq Ədalət Nəsibovun, Arif Babayevin, bir də necə deyərlər, təpədən-dırnağa Aşıq Şakirin pərəstişkarı olan əməkdar elm xadimi, akademik Vasim Məmmədəliyevin Aşıq Şakirlə bağlı xatirələrini oxuculara təqdim etmək istədim.

**Aşıq Ədalət Nəsibov**
*Əməkdar İncəsənət xadimi*

– Böyük şəxslər, şəxsiyyətlər barədə adam istəyir ki, bütün varlığı ilə danışsın. Aşıq Şakir də belə şəxslərdən, belə sənətkarlardan biridir. Mən rəhmətlik Aşıq Şakirlə azınnan 20-30 dəfə bir yerdə olmuşam. Eləcə də, Aşıq İmran, Aşıq Əkbər, Aşıq Məmmədağa, Aşıq Pənah və başqa tanınmış sənətkarlarla bir yerdə olmuşuq. Bir yerdə konsertlər vermişik. Çox yaxşı münasibətimiz olub. Bir-birimizə həmişə hörmət və ehtiram

göstərmişik. Bunu hər kəs deyib, indi də deyir: Aşıq Şakir çox qüdrətli sənətkar idi. Hətta XX əsrin yeganə sənətkarlarından idi. Əvəzolunmaz idi.



Şakirin məşhur "Boylana-boylana" mahnısı var, Hüseyn Cavanın sözlərinə oxuyub. Necə də gözəl oxuyub:

*Azad bir qız girib bağa,*
*Gəzir boylana-boylana.*
*Ala gözün sola-sağa,*
*Süzür boylana-boylana.*

*Alıb kitabı əlinə,*
*Baxır hər bir sətirinə.*
*Atılıb eşqin gölünə,*
*Üzür boylana-boylana.*

Ümumiyyətlə, Aşıq Şakirin "Boylana-boylana", "Bala Nərgiz", "Kəndimiz" və bu kimi mahnıları dillər əzbəri idi.

Şakirin ifalarını həmişə sevə-sevə dinləyən, dinləməkdən doymayan insanlar istəyirdilər ki, onun üzünü görsünlər. Yəni, görsünlər ki, bu cür gözəl oxuyan sənətkar kimdir, necədir?!

1956, 1959-1960-cı illərdə Aşıq Şakirlə birlikdə Moskvada konsertlərdə olmuşuq. Uğurlu çıxışımıza görə bir çox medallar almışıq. Mən hər yerdə Şakirin çox böyük, istedadlı sənətkar olduğunu bir daha yaxından duyub, hiss etmişəm. Hər yerdə Aşıq Şakirə böyük hörmət və ehtiram vardı.

İndi də görürsən bəzi sənətkarlar var, bir vaxtlar Aşıq Şakirin ifa etdiyi mahnıları onlar da oxuyurlar. Məsələn, "Şirvan şikəstəsi"ni oxuyurlar. Amma onların əksəriyyəti bu ləzzəti, bu şirinliyi verə bilmirlər. O mahnıların şirinliyi, ləzzəti Şakirnən getdi. Şakirin ləzzəti özüynən getdi.

Sənət aləmində mənim Aşıq Şakirə böyük rəğbətim var. Mən onun o böyük sənəti qarşısında səcdə edirəm.

Aşıq Şakir sənətindən söhbət açarkən xəyalım ötən illəri dolaşır. O vaxtlar rabitə dirəklərində reproduktora bənzəyən radiolar qoyulurdu. Camaat böyük həvəslə yığışırdı həmin radioların qarşısına, Şakirin oxumalarına xüsusi maraqla, diqqətlə qulaq asırdılar.

O vaxtlar Aşıq Şakir, Aşıq Qurbanxan, Aşıq Məmmədağa öz aralarında belə qərara gəlmişdilər ki, heç olmazsa, ayda bir dəfə məni də özləri ilə iştirak etdikləri məclislərə aparsınlar. Beləcə, mən onlarla sənət yoldaşı olurdum. Aşıq Şakir oxuyanda hamı bütün varlığı ilə diqqət kəsilirdi.

Aşıq Şakiri Türkiyədə də çox sevirdilər. Orada çox adamda Şakirin valları, kasetləri vardı. Soruşanda deyirdilər ki, Şakirin vallarını, lent yazılarını çoxdan əldə etmişik. Eləcə də İranda. Burada demək olar, hər evdə, hər maşında Şakirin valları, lent yazıları var. Aşıq Şakir sözün əsl mənasında sayılıb-seçilən, sevilən sənətkar olub. Hər kəsin ürəyində onun yeri var.

Şirvan aşıq sənətində çox sənətkarlar olub və indi də var. Amma bunu tək mən demirəm, hamı deyir, hətta aşıq sənətinə azacıq belə meyli olan adamdan soruşsan, o da deyər ki, Aşıq Şakir onların sərkərdəsi idi...

Allah-taala Aşıq Şakirə hər şeyi vermişdi: səs desən səs, boy desən boy, şəxsiyyət desən şəxsiyyət, səxavət desən səxavət, ədəb-ərkan... Bütün bu nəcib keyfiyyətlər Şakirdə cəmləşmişdi. Buna nə vermədimişdi O Böyük Qüdrət sahibi?! Onu bəyənməmək, onu duymamaq, şəxsiyyətinə hörmət eləməmək elə bil, Allahına nankor olmaq kimi bir şeydi.

Mən Aşıq Şakirə bir qardaş kimi, dost kimi, ustad kimi baxıram. Dəfələrlə çörək kəsmişik, çörək yemişik. Hamısı gözümün qabağına gəlir. Aşıq Şakir haqqında o qədər sözüm var ki, vallah, bilmirəm hansını deyim, necə deyim?

Yenə də Azərbaycan sənətçilərinin vaxtilə Moskvada keçirilmiş mədəniyyət və incəsənət günlərini xatırlayıram. Həmin konsertlərdə Aşıq Şakirin ifaları yadıma düşür. Şakirin adı gələndə konsert salonunda

alqışların ardı-arası kəsilmirdi. Təkcə azərbaycanlılar deyil, qeyri-millətdən olan tamaşaçılar da Şakirə böyük maraqla, diqqətlə baxırdılar. Gözəl səs, nurani çöhrə, yaraşıqlı boy-buxun, şux, əzəmətli qamət...

Şakir səhnəyə çıxıb bir dəfə o yandan bu yana gedəndə alqış-alqışa qarışırdı. Aşıq Şakirin ifaları, elə təkcə onun "Boylana-boylana"sı aşıq sənətini o vaxtlar yüksəkliyə qaldırdı. Şirvan aşıq sənətində, Şirvan aşıqlarının yetişməsində Şakirin böyük zəhməti olub. Eləcə də bizim üzərimizdə onun haqqı-sayı var.

Aşıq Şakir elə bil göylərdən düşmüşdü. Tanrının vergisi idi. Onun nə şəxsiyyətinə söz olardı, nə sərvətinə, nə də səxavətinə söz olardı.

Üz-gözündən nur yağırdı, danışığı, tələffüzü gül kimi tər-təmiz idi. Sözləri mahnıda çox səlis, aydın, həm də yerli-yerində işlədirdi.

Məşhur "Kəndimiz" mahnısında oxuyurdu:

*Qızıldır hər qarış torpağın-daşın,*
*Odur ki, dağlardan ucadır başın.*
*Şakirəm, hüsnünə min dastan qoşum,*
*Layiqsən şeirə, sözə, kəndimiz.*

Yəni Şakir deyirdi ki, ay mənim elim-obam, ay mənim kəndim, ay mənim vətənim, sən şeirə, sənətə layiqsən... Bu sözləri necə də gözəl oxuyurdu. Dinlədikcə adama ləzzət verirdi.

Və yaxud Şakir özünəməxsus gözəl bir ritmlə, gözəl bir ahənglə deyəndə ki:

*Xub yaraşır nazalı yara,*
*Ağ üstündən geysə xara.*
*Əsli göyçək olanlara,*
*Al da birdi, şal da birdi.*

*Şakir bağdan bir gül dərsə,*
*Gözəllərdə vəfa görsə.*
*Yarın sənə busə versə,*
*Sağ da birdi, sol da birdi.*

Bu sözlər, bu mahnılar Şakirin şirin səsində necə də gözəl səslənirdi. Adam dinləməkdən doymurdu.

Şakirin gözəl nağıl və dastanlar söyləmək məharəti vardı. Şakir öz nüfuzunu qoruyan, sənətinin hörmətini saxlayan sənətkar idi.

Çağırılmayan yerə getməzdi, çağırılanda da öz sanbalını, salğarını qoruyardı. Bu, onun sənətinə olan məsuliyyətdən irəli gəlirdi.

Aşıq Şakirlə 25-30 il bir yerdə sənət yoldaşlığım olub. Onda hələ zərrə qədər də olsun bir qüsur görməmişəm. Əksinə, həmişə mehriban, səmimi, ürəkaçan adam olub.

Aşıq Şakir haqqında saatlarla, günlərlə danışmaq olar. Onun, sözün həqiqi mənasında, tayı-bərabəri olmayıb. Aşıq Şakir XX əsrə öz sənəti ilə naxış vurdu. Allah ona rəhmət eləsin. Ruhu şad olsun!

**Arif Babayev**
*Xalq artisti, professor*

– Əvvəla, onu deyim ki, Allah Aşıq Şakirə rəhmət eləsin, qəbri nurla dolsun. Mən peşəkar bir xanəndə kimi Aşıq Şakirin lent yazılarına, o cümlədən oxuduğu bir-birindən gözəl aşıq mahnılarına, gözəlləmələrə, “Şirvan şikəstəsi”nə, eləcə də ifa etdiyi aşıq mahnılarının arasında oxuduğu muğamlara çox maraqla qulaq asır və bu ifalardan hədsiz zövq alıram. Şakir həm aşıq idi, həm də xanəndə. Mən deyərdim ki, Şakir həm də şair idi, bəstəkar idi. Oxuduqlarını çox gözəl oxuyurdu. O oxuyanda adam ona qulaq asmaqdan doymurdu, yorulmurdu. Mən onu çox sevirdim. Onu toylarda tez-tez görmək istəyirdim. Onu həmişə ürəklə dinləmişəm. Çünki özü də ürəklə oxuyurdu. Onu xalq sevirdi. Sənətkarın xoşbəxtliyi ondadır ki, onu xalq sevir. Şakiri də xalq sevirdi. O, öz sənəti ilə xalqın, el-obanın qəlbinə hopmuşdu. Şakir sözün əsl mənasında ustad sənətkar idi. Lap belə, necə deyərlər, yağım daşsaydı da, ona hökmən qulaq asardım. Bu, özümdən asılı deyildi, ürəyimdən gələn bir istək idi.

Allah Aşıq Şakirdən heç nəyi əsirgəməmişdi. İnsan üçün yaxşı nə varsa, hamısını ona bəxş eləmişdi. Gözəl boy-buxun, qədd-qamət, nurani çöhrə. Mən Şakiri həmişə gözəl sənətkar saymışam. Gözəl bir sənətkar, kamil bir insan kimi o, bu gün də mənim qəlbimdədir. Onu həyatda çox görmüşəm, ünsiyyətdə olmuşam. Çox mehriban, səmimi, əsl dost ürəkli, qayğıkeş bir insan idi. Adamla elə görüşürdü ki, ürəyini vermək istəyirdin ona. Deyirdin, bax, əsl insan belə olar.

Mən Aşıq Şakirin o gözəl, insana zövq verən, ürəkləri riqqətə gətirən səsini, mahnılarını böyük şövqlə dinləyirəm. Mən onun sənətinə vurğun olmuşam. Bu gün də onun səsini böyük şövqlə, həm də kövrək duyğularla dinləyirəm. Heyif ki, Şakir həyatdan çox tez getdi. Mən bu acı xəbəri eşidəndə çox sarsıldım. Belə sənətkarlar çox yaşamalıdı. Çünki musiqi dünyamızın, xalq sənətimizin belə ustadlara həmişə böyük ehtiyacı var.

Mən Aşıq Şakirdən söhbət açarkən onun sənət yoldaşları olmuş mahir zurna-balaban ustası Həsrət Hüseynovu, xanəndə Eynula Cəbrayılovu da yada salmaq istəyirəm. Onlar da çox gözəl, dinləyicilərinin zövqünü oxşaya bilən sənətkarlar idilər. Onlar da bu dünyadan vaxtsız köçdülər. Allah hər üçünə rəhmət eləsin, qəbirləri nurla dolsun.

**Habil Əliyev**
*Xalq artisti*

– Aşıq Şakir elə bir sənətkar idi ki, bəlkə heç özü də bilmirdi ki, nə boyda bir sənətkardır. Çünki, əgər özü bilsəydi ki, nə boyda, nə cür sənətkardı, heç özü də dözə bilməzdi. O, Allahla bağlı idi. Allah ona elə bir səs vermişdi ki, o səs heç kimə qismət olmayıb. Ona təkcə Aşıq Şakir deyiləndə, şəxsən mənim xətrimə dəyirdi. Axı, bu adam təkcə aşıq deyildi, həm də gözəl xanəndə idi. Təkcə aşıq deyibən onu kiçiltmək olmazdı. Bu sənətin hər ikisi Şakirdə çox gözəl cəmləşmişdi. Hər ikisi onda yeganə idi.

Düzdür, Şakir xanəndə kimi bu sənəti işlətmədi. Amma məclislərdə, konsertlərdə aşıqlıq sənətini xanəndəliklə sintez etməyi bacarırdı. Onları bir-birinə ustalıqla qoşurdu. Təsəvvür edin ki, bu sintez o qədər təzə, yeni səslənirdi ki, bu, heç bir aşığa və ya xanəndəyə nəsib olmurdu. Onun böyüklüyü, ifa məharəti bir də onda idi ki, aşıq sənəti içərisində muğamları necə də gözəl səsləndirirdi. O vaxtlar biz Aşıq Şakiri deputat seçdik. Ona layiq idi. Ona görə də Şakir... necə deyim, qoy bu sözü qoyub o birinə keçim, bir dəfə rəhmətlik Şakir zəng elədi bizə, dedi Habil, mənim qızımın toyudu, istəyirəm o toya sən gələsən, öz ürəyin istəyən dəstəni də gətirəsən. Ola bilsin, mən də gəlib orada əyləşəcəm. Mən bilirəm ki, sən olan toy daha yaxşı keçəcək. Şakirin bu sözündən sonra mən yaxşı sənətçilər yığdım, getdim o məclisə. Kürdəmirdə Əlövsət adlı bir nəfər vardı, Şakir onunla quda olurdu.

Şakir də gəldi əyləşdi o məclisdə. Şakir öz gəlişi ilə məclislərə bir yaraşıq, bir gözəllik verirdi. Söz yox ki, hər halda toy sahibi də layiqli adam idi, özlərinə görə layiqli də məclis qurmuşdular. Ümumiyyətlə, mən dəfələrlə görmüşəm ki, məclislər nə qədər böyük, nə qədər şərafətli olsaydı, Şakir o məclisə nəinki layiq idi, hətta o məclislər Şakirin orada iştirakına görə, dediyim kimi, daha əzəmətli, daha təmtəraqlı görünürdü. Mən çox məclisləri belə görmüşəm.

Eşitdiyimə görə, oğlu da sənətə gəlib, Məmmədağanı deyirəm, yaxşı qarmon çalır. Hər halda onun sənətindən Şakirin ətri gəlməlidir və inanıram ki, belə də olar.

Aşıq Şakir şahların məclisinə layiq sənətkar idi.

Şakir çox böyük sənətkar idi. Allah ona rəhmət eləsin. Onu təkcə ailəsi deyil, bütün respublikamız, xalqımız itirdi.

Aşıq Şakirdən danışanda onun sənət yoldaşları Həsrət Hüseynov, Eynulla Cəbrayılov da yada düşür. Çünki onlar bir yerdə, bir məkanda yetişmiş, yaşayıb-yaratmış sənətkarlar olublar.

Həsrət Hüseynov nəfəsli alət olan təkcə balabançalan kimi yox, çox mahir zurna ustası kimi də respublikada tanınmışdı. Adətən respublikada tanınanlar Bakı mühitində yaşayanlar olur. Çünki bunların qəzetlərdə, radio və televiziya ilə yaxından əlaqə yaratmaq imkanı olur. Ancaq haqqında söhbət gedən sənətkarlar bütün ömürləri boyu rayonda yaşamış, mərkəzdən uzaq olmuşlar. Amma buna baxmayaraq, öz istedadları ilə daha çox parlamış, şan-şöhrət qazanmışlar. Həsrət, mən deyərdim ki, zurna alətini ikinci dəfə həyata gətirdi, xalqın sevimli alətinə çevirdi. Aşıq Şakir haqqında dediyim bir çox fikirləri Həsrətə də aid eləmək olar. Belə ki, onun gözəl xasiyyətləri sənətkarlığı ilə üst-üstə düşürdü. Aşıq Şakirdə olduğu kimi, Həsrətin də sənəti bir örnək kimi çoxlarına məktəb olub. Bundan indi də istifadə edirlər.

Yadıma bir xatirə düşdü. 1959-cu il idi. Rəhmətlik Cahangir Cahangirov Moskva dekadasında iştirak etmək üçün bir xalq ansamblı yaratmışdı. Çox gözəl çalırdılar. Dediyim kimi, 1959-cu il idi. Moskva dekadasına getmişdik. Rəhmətlik Şövkət xanım, Sara xanım və bir neçə tanınmış sənətkar nümayəndə heyətinin tərkibində idilər. Həsrət də bir çox sənət yoldaşları ilə bizimlə idi. Tula şəhərinə konsertə gedirdik. Avtobusda birdən bu çalğıçıların təbi gəldi. Zurnaçılar, balabançılar başladılar çalmağa. Hamısı da gözəl sənətkar idilər. Hərə bir az çalıb öz məharətini göstərdi. Həsrət də əyləşmişdi bir tərəfdə. Amma çalmırdı. Üzümü Həsrətə tutub dedim: "Həsrət, sən niyə çalmırsan?" Dedi: "Habil, daha onlar çaldılar da". Dedim, mən səndən xahiş edirəm... Həsrət başladı çalmağa, çaldı, nə çaldı, necə deyim, necə danışım... Deyiləsi deyil. Avtobusdakılar mat-məəttəl qaldılar.

Aşıq Şakir və onun sənət dostları dünyadan vaxtsız getdilər. İş burasındadır ki, yerləri boş qalıb. Arzu edərdim ki, onları əvəz edən sənətkarlar yetişsinlər, onların yeri boş qalmasın. Belə sənətkarlar həmişə təbliğ olunmalıdır. Onlar haqqında tez-tez yazılmalı, deyilməlidir. Onlar dünyadan köçdülərsə də, sənət yolunda, sənət naminə çəkdikləri zəhmət, əziyyət yaşayır. Nə qədər ki, özləri sağ idi, yaşayırdılar, özləri də sənətlərini yaşadırdılar. İndi isə onları yaşatmaq, gələcək nəsillərə çatdırmaq bizlərin borcudur, əlaqədar təşkilatların borcudur.

Bu gün biz Aşıq Şakirdən söhbət açırıq, Şakirdən danışırıq. Mən Aşıq Şakir haqqında həmişə hər kəsdən yalnız xoş sözlər eşitmişəm. Sənəti duyub başa düşənlər də, heç duymayanlar da, bir sözlə, hamı Şakiri çox istəyirdi.

Şakir sənəti yarımçıq qaldı. Mən deyərdim ki, Azərbaycan xalqı, sənətsevər insanlar Şakirdən doymadı. Allah ona rəhmət eləsin.

**Vasim Məmmədəliyev**
*Azərbaycan MEA-nın akademiki,*
*Əməkdar elm xadimi, professor*

– Aşıq Şakir Hacıyev Azərbaycan aşıq sənətinin ən görkəmli nümayəndələrindən biridir. Aşıq Şakir Şirvan aşıq məktəbinin ən gözəl ənənələrini yaşadan və inkişaf etdirən bir sənətkar olub.

Azərbaycanda iki aşıq məktəbi var: Şirvan aşıq məktəbi və Göyçə, Borçalı aşıqlarının təmsil olunduğu Qərb aşıq məktəbi.

Bunlar bir-birini tamamlayan gözəl sənət nümunələridir.

Muğam sənəti də belədir. Belə ki, muğamda Qarabağın, Şirvanın, Bakının ifaçılıq məktəbi var. Azərbaycanın Qərb aşıq ifaçılığında saz mühüm yer tutur. Şirvan aşıq məktəbində sazla yanaşı balaban və digər çalğı alətlərindən də istifadə olunur. Daha bir fərq odur ki, Şirvan aşıq ifaçılığında xanəndəliyə də xüsusi meyil vardır.

Ümumiyyətlə, aşıq gərək gözəl saz çala bilsin, bütün saz havalarını incəliyinə qədər mənimsəsin. Aşığın gərək yaxşı səsi olsun, yaxşı oynaya, rəqs edə bilsin. Aşıqda gözəl şeir demək, dastan söyləmək qabiliyyəti olmalıdır. Aydın, səlis və rəvan tələffüz də aşıq sənəti üçün vacib olan xüsusiyyətlərdəndir. Bütün bunların vəhdəti ilə kamil sənətkar olmaq mümkündür. Odur ki, aşıqlıq sintetik bir sənətdir. Həm də mürəkkəb bir sənətdir.

Bunlar hər iki ifaçılıq məktəbinə xasdır. Şakirdə bunun hər ikisi vardı.

Şirvan aşıq məktəbinə aid olan Aşıq Şakirdə xoş gələn cəhət o idi ki, Şakir həm də Qərb aşıq məktəbinin ənənələrini gözəl bilirdi. Aşıq Şakirin Həsrət Hüseynov kimi ustad balabançalan müşayiətçisi, xanəndə Əliyusif kimi sənətçi yoldaşları vardı.

Şakir gözəl sənətkar olmaqla yanaşı, bu ulu sənətin sirlərini daha dərindən öyrənməyə çalışırdı. Xüsusilə də mükəmməl saz çalmağı öyrənmək onun əsas sənət qayğılarından olmuşdur. Eşitdiyimə görə, o, bu məqsədlə Tovuza, Qazağa, Borçalıya gedir, ustad aşıqlardan saz çalmağı, müxtəlif saz havalarını öyrənirdi. Allah-taala Aşıq Şakirə gözəl,

məlahətli səs vermişdi. Bu gözəl sənətlə yanaşı ona zahiri gözəllik bəxş etmişdi. Hər şey vardı Şakirdə: gözəl səs, boy-buxun, gözəl qamət. İfaçılıq səsi də gözəl idi, adi danışıq səsi də. Oxuduğu mahnıların, istifadə etdiyi muğam elementlərinin sözlərini çox aydın, səlis tələffüz edirdi.

Şakir aşıq sənəti ilə yanaşı, muğamları da gözəl bilirdi. O biri aşıqlar olurdu ki, bir neçə ağız muğam oxuyardılar. Amma Şakir muğamı hərtərəfli və dərindən bilirdi. Əgər o, sazı yerə qoysaydı, gözəl aşıq olduğu kimi, gözəl də xanəndə olardı. Çünki qeyd etdiyim kimi, muğamlarımızı gözəl bilirdi. Eşidəndə adam təəccüb qalırdı: aşıq olasan, muğamları belə mükəmməl biləsən. Bir var ki, muğamdan bir-iki ağız oxuyasan, bir də var ki, dəstgah oxumaq. Bunu hər kəs edə bilməzdi. Belə məharətinə görə hətta peşəkar xanəndələr ona qibtə edirdilər. Bəli, Şakir aşıq olmasına baxmayaraq, əlinə dəf alıb tar-kamanla gözəl dəstgah deyə bilirdi. Toylarda görürdük ki, bir nağıl və ya dastan danışa-danışa gözəl bir muğam dəstgahı tutub gedirdi. Muğamın ayrı-ayrı hissələrini çox gözəl ifa edirdi. Bu, onun nəticəsi idi ki, Şakirin çox gözəl, xanəndələrin dili ilə desək, qaltanlı səsi vardı. Bu səs həm aşıq musiqisi üçün, həm də muğam üçün yarayırdı.

Şakir bizim xalq nağıllarını, dastanları çox gözəl bilirdi. Şakir yaxşı məktəb keçmişdi. Gözəl muğam ifaçısı olsa da, Şakir musiqi tariximizə ustad aşıq kimi daxil olmuşdur.

Şakirin çox gözəl zövqü vardı. Həm xanəndə üçün, həm aşıq üçün əsas meyar, əsas şərt, yenə də deyirəm ki, səsdir. Allah-taala ona bu səsi vermişdi. Üstəlik də yaxşı nağıl və dastan bilmək və onları gözəl söyləmək, yaxşı saz çalmaq və s. Bunların hamısı Şakirdə vardı. Odur ki, mənim aşıq Şakir sənətinə çox böyük hörmətim olub. O gözəl, unudulmaz sənət bu gün də mənim qəlbimdə, hiss və duyğularımda yaşayır.

Aşıq Şakirdən söz düşəndə xəyalım uzun illər bundan əvvəllərə, uşaqlıq və yeniyetmə çağlarıma gedib çıxır. Aşıq Şakiri ilk dəfə öz kəndimizdə – Kürdəxanıda toylarda görmüşəm. Sonralar onu Abşeronun digər kəndlərində, o cümlədən Nardaranda, Hövsanda, Bilgəhdə, Türkanda toylarda çox görmüşəm. Şakirin sənətinə, şəxsiyyətinə hər yerdə böyük hörmət və istək vardı. Ötən o gözəl illəri, aşıq Şakirli məclisləri, toy mərasimlərini hər dəfə yada salanda kövrəlirəm. Doğrudan da Şakiri biz çox tez itirdik. Görəsən, belə bir sənətkar bir də gələcəkmi dünyaya? Şakirin oxuduğu aşıq havalarını, “Şirvan şikəstəsi”ni, “Sarıtorpaq şikəstəsi”ni, “Boylana-boylana”, “Bala Nərgiz”i, daha nələri, nələri Şakir kimi oxuyan olacaqmı? Şakir ifa etdiyi mahnılara elə möhür vurub ki, həmin mahnıları başqalarının ifasında eşidəndə, sözün düzü, Şakirdən aldığın

zövqü ala bilmirsən. Şakirin sənət dəst-xətti, Şakir nəfəsi tamam başqa bir aləm idi. Təkrarolunmaz sənətkar sözü də məhz belələrinə aiddir.

"Şirvan şikəstəsi"ni hər dəfə Şakirin ifasında eşidəndə gözlərim yaşarır. İlahi, bu necə səsdir, necə boğazdır?!

Şakirin səsi o qədər gözəl idi ki, adam ancaq onun səsinə valeh olurdu, oxuduğu sözün necəliyinə fikir verməyə macal tapmırdı, əhəmiyyət vermirdi. Şakirin ifasında o dövrün tərənnümü kimi səslənən bəzi mahnı sözləri bu qəbildəndir. Mahnının mətninə, ayrı-ayrı sözlərinə fikir verəndə görürsən ki, əslində bunlar adi söz yığınıdır, tərənnüm xətirinə deyilən sözlərdir. Amma həyati mənada yerinə düşməyən bu sözlər Şakirin ifasında, onun gözəl və ecazkar səsinin fövqündə elə cilalanırdı, elə təmizlənirdi ki, həmin o primitiv sözlər məna baxımından tamamilə kölgədə qalırdı. Bu sözlər Şakirin səsində sehirlənirdi... Adicə vəzni və qafiyəsi olan bu söz yığnağı Şakirin o gözəl, məlahətli ifasında elə gözəl səslənir ki, adam istəyir elə ona dəfələrlə qulaq assın.

Mənası olmasa da, Şakirin səsi bu sözləri elə bəzəyir, elə düzəyir ki, adam elə bilir, gözəl bir şeirə qulaq asır. Şakir səsinin gözəlliyi həmin sözün mənasızlığını itirir.

Toy məclislərində aşıq Şakirin ifasında "Aşıq Qərib"i, "Əsli və Kərəm"i, "Abbas və Gülgəz"i və neçə-neçə belə gözəl dastanlarımızı eşitmişəm. Əşşi, bu nələr edirdi. Məclis əhli Şakirin istedadına, Şakirin məharətinə mat-məəttəl qalırdı. Bir də görürdün ifasında gətirib gəlirdi "Mirzə Hüseyn segahı"nı, Haşım pərdəsində "Segah" oxuyardı, "Orta segah" oxuyardı. Xaric pərdədə "Xaric segah" oxuyardı. Bəh-bəh, səs bal idi. Həm də Şakir aşıq musiqisi ilə muğamı çox gözəl birləşdirirdi. "Sarənc" oxuyardı. O "Sarənc" hələ də mənim qulağımdadı. O cür "Sarənc" mən hələ eşitməmişəm. "Zəminxarə" oxuyardı, "Şikəsteyi-fars" oxuyardı, "Dilkəş" oxuyardı. Bütün bunlarda necə gözəl, necə də ustalıqla gəzişərdi.

Fikirləşirdin ki, pərvərdigara, aşıq da belə muğam oxuya bilərmi? Adam Şakiri dinləməkdən doymurdu.

Şakirin ustad sənətkarlığı, onun böyük istedadı bəzi adamlarda həsəd, paxıllıq oyadırdı. Bizim Kürdəxanı kəndində bir Hacıbala kişi vardı. Rəhmətlik hal əhli idi, sənət xiridarı idi. Musiqiyə, sənətə çox bağlı adam idi. Özünün şeir yazması da vardı. Aşıq Şakiri hədsiz dərəcədə sevirdi, Şakir sənətinin vurğunu idi. O vaxt Hacıbala kişi söhbət edib, deyirdi: "Bir gün söz çıxdı ki, bəs, Şakir ölüb. Çox pis oldum. Yerə-göyə sığışmırdım. Telefon-zad da yox idi ki, bir xəbər tutum, görüm ki, bu xəbər düzdür, ya yox. Xəbəri eşidən kimi dayana bilmədim, durub getdim Kürdəmirə. Gecə çatdım ora. Vağzalda qatardan düşdüm.

Adamlardan xəbər alıb Şakirin evini tapdım. Çox narahat idim. Hey fikirləşirdim ki, görəsən, nə ilə üzləşəcəm. Nigarançılıq içərisində qapını döydüm. Səsə Şakir çıxdı. Şakirin səsini eşidəndə çox sevindim, əlimi göyə qaldırıb, dedim: “Allah, sənə şükür, Şakir evindədi, salamatçılıqdı...” Şakir gəlib qapını açdı, gördü ki, mənəm. Məni görcək həm sevindi, həm də təəccübləndi: “Ay Hacıbala kişi, xoş gəlmisən”, – deyib məni qucaqladı. Görüşüb öpüşdük. Təəccübünü gizlətmədən dedi: “Ay Hacıbala kişi, bu gecə vaxtı səndən nə əcəb? Xeyirdimi heç olmasa... Sən Allah, bir de görüm nə olub? Bəlkə bir hadisə-filan var. Bəlkə pul lazımdı, bir kömək lazımdı?” Şakir çox arif adam idi, həssas adam idi. Hiss edirdi ki, bu gəlişdə nəsə bir iş var... Mən Şakiri sağ-salamat gördüyümdən sevincimin həddi-hüdudu yox idi. Amma bilmirdim ki, bu qəfil gəlişimin səbəbini necə izah edim. Axı, mən ona deyə bilməzdim ki, bəs, eşitdim sən ölmüsən, ona görə gəlmişəm. Bütün bu məqamlarda tutarlı bir bəhanə axtarırdım ki, Şakiri arxayınlaşdıram, onu nigaran qoymayam. Dedim, Şakir, hər şey yaxşıdır, salamatçılıqdır. Elə səni könlüm istədi, səndən ötrü darıxdım, ona görə durub gəldim səni görməyə... Gəlişimə Şakir cox sevindi. O saat qonum-qonşuları çağırdı evinə, dedi, mənim Bakıdan ən əziz, ən hörmətli dostlarımdan biri gəlib. Ayağımın altında qoyun kəsdi. Yaxşı bir qonaq süfrəsi açdırdı...”.

Göründüyü kimi, Şakir çox həssas, qonaqpərvər, comərd, əliaçıq, üzü nurlu, dost qədri bilən, çətin anlarda dost arxasında duran adam idi.

Şakir bir insan kimi də kamil idi, bir sənətkər kimi də kamil idi. Aşıq Şakir Şirvan aşıq məktəbinin mən deyərdim ki, sonuncu nüməyəndəsi idi, yəni, zirvəsi idi.

Mən onu dinləyəndə bu gün də kövrəlirəm, gözlərim yaşarır. Doğrudan da, aşıq sənəti necə böyük bir gücə, təsirə malikdir. İlahi, bu səsdə nə böyük hikmət var!

İstər Qərb aşıq məktəbi olsun, istərsə də Şirvan aşq məktəbi – hər ikisi çox böyük təsir gücünə malikdir. Bunlar bötüvlükdə ulu aşıqlıq sənətimizin böyüllüyünü, əzəmətini göstərir.

Bu ulu sənət aləmində aşıq Şakirin öz yeri vardı. Onun məclis aparması, gözəl nağıllar, dastanlar söyləməsi bu gün də gəlir durur gözlərimin qarşısında.

Düzü, mən inana bilmirəm ki, Aşıq Şakir səsində, Şakir əzəmətində, Şakir görkəmində, Şakir diapozonunda bir aşıq meydana gəlsin. Hələ ki, yoxdur. Amma dünya xali deyil. Bəlkə də olacaq. Arzum budur ki, olsun, yeni-yeni Şakirlər yetişsin. Onda ulu aşıqlıq sənətimizin ömrü də uzun olar, əbədi olar.

Aşıq Şakirin irsi, Şakirin məktəbi öyrənilməlidir, inkişaf etdirilməlidir. O vaxtlar audio, video yox idi. Amma maqnitofon vardı. Ola bilsin ki, Şakirin oxuduğu toy məclisləri maqnitofon kasetlərinə yazılırdı. Və yaxud aşıq Şakirin səsi yazılmış vallar vardı. Bunları toplamaq, ümumiləşdirmək və Şakirin sənətini, yaradıcılığını əks etdirən disklər buraxmaq bu gün çox vacibdir. Çünki Şakirin yaratdığı məktəb, qoyub getdiyi irs dərindən öyrənilməyə və geniş təbliğ olunmağa layiqdir. Şakir gələcək sənətkarlar üçün ən yaxşı örnəkdir. Şakirin pərəstişkarları olduqca çoxdur.

Aşıq Şakir həyatdan gedib. Amma yenə deyirəm, çox yaxşı olar və bu çox vacibdir ki, onun bir vaxtlar səsi yazılmış lentlər, vallar, kimdə nə var hamısı axtarılıb tapılsın, cəmləşdirilsin, yenidən kasetlərə, disklərə yazılsın. Cəm halında, yəni, harada, kimdə nə varsa, hamısı cəmlənsin, yazılsın. Bunlar gələcək nəsillərə lazımdır. Şakirin sənətindən öyrənməyə çox böyük ehtiyac var. Aşıq Şakirin ölməz sənəti hələ də öyrənilməyib. Gənc sənətçilər istəyirlərsə ki, yaxşı sənətkar olsunlar, istəyirlərsə ki, musiqisevərlərin rəğbətini qazansınlar, sənət aləmində öz sözlərini deyə bilsinlər, onda gərəkdir ki, aşıq Şakir kimi ustad sənətkarlardan öyrənsinlər, bu ölməz sənətdən məharətlə istifadə etsinlər.

Çünki Şakirin ulu aşıq sənətimizdə müstəsna yeri vardır. Türk ozanı, saz və aşıq xalqımızın qədim sənət nümunəsidir. Nə qədər ki, aşıq sənəti var, Şakir həmişə anılacaq, həmişə yaşayacaq. Şakirin irsi bundan sonra öyrəniləcək. Xalq aşıq Şakirin gur dağ selinə bənzəyən o şaqraq səsindən, Şakir sənətindən həmişə zövq alacaq.

Mən çox istərdim ki, radio və televiziyamızda, aşıq sənəti ilə məşğul olan mütəxəssislərimiz, incəsənətlə, aşıq musiqisi ilə məşğul olan tədqiqatçılarımız aşıq Şakir yaradıcılığına, Şakir sənətinə daim müraciət etsinlər.

Şakir haqqında nə varsa öyrənilsin, elmi-bədii məqalələr, xatirələr yazılsın. Aşıq Şakir xalqın sərvətidir.

Böyük sənətkarlar insan kimi də böyük olurlar. Əgər sənət kamildirsə, sənətkar da kamildir. Kamil adamlar sənətdə də, elmdə də böyük olurlar.

Adətən çox böyük sənətkarları, alimləri elmdə, sənətdə də bütöv görmüşəm. Elmdə, sənətdə kamil olan insanlar həyatda da böyük şəxsiyyət olurlar. Aşıq Şakir də böyük, kamil sənətkar kimi həyatda bütöv bir şəxsiyyət idi.

Məşhur şərq filosofu Cəlaləddin Ruminin belə bir sözü var: "Biz öləndən sonra bizim məzarımızı torpaqlarda axtarmayın. Bizim məzarımız arif insanların qəlbindədir…"

Aşıq Şakir də aşıq sənətini sevən, sənətin, sənətkarın qədrini bilən insanların qəlbindədir. O, xatirələrdə əbədi yaşayacaq. Allah Şakirə rəhmət eləsin, məzarı nurla dolsun!

**Əlibaba Məmmədov**
*Xalq artisti*

Mən Azərbaycanda çox aşıqlar görmüşəm. Daha dəqiq desəm, Aşıq Qurbandan və belə məşhur sənətkarlardan bəri çox aşıqlar görmüşəm. Yəni, öz dövrümdə, aşıqları duyan, aşıqları başa düşən vaxtlarımdan iki güclü aşıq görmüşəm. Bunlardan biri rəhmətlik Aşıq Şakir idi, biri də rəhmətlik Aşıq Pənah. Allah hər ikisinə rəhmət eləsin. Onlar çox gözəl, çox görkəmli aşıqlar idi. Hər birinin öz gözəl xüsusiyyəti vardı. Məsələn, Aşıq Şakirin çox gözəl muğam ifaçılığı vardı. Əruzu yaxşı bilirdi. Səs imkanları geniş idi. Gözəl ifa ilə yanaşı, həm də gözəl oynamaq qabiliyyəti vardı. Odur ki, mən Aşıq Şakirin sənətinə, sözün əsl mənasında, aşiq idim. O, istedadlı sənətkar kimi mənim yaxın dostlarımdan olub. O, hiss edirdi ki, mən doğrudan da onun pərəstişkarıyam. Vaxtilə bir-birimizə çox bağlı olmuşuq, bir-birimizin evinə gedib-gəlmişik. Mən Aşıq Şakiri böyük sənətkar hesab edirdim.

Məsəl var deyərlər: görünən dağa nə bələdçi? Aşıq Şakir də beləcə hamı tərəfindən sevilən, tanınan bir sənətkar idi. Onun şəxsiyyəti, sənəti hər kəsdə böyük iftixar oyadırdı.

Abşeron kəndlərində elə bir məclis yox idi ki, Aşıq Şakir orada olmasın. Şakirin bütün oxumaları hamı kimi mənim də ürəyimə çox yatırdı. İfa etdiyi mahnıların hamısı bir-birindən gözəl idi və adam bunlara xüsusi şövqlə qulaq asırdı.

Maştağa kəndində Şirinbala adlı bir nəfər vardı. Toylarda sərpayılıq edərdi. Biz ona pəhləvan deyərdik. O, oğluna toy edirdi. Şirinbala bir gün dedi: "Xanəndələr məndən inciməsinlər (o vaxtlar mənim də çox dəbdə olan vaxtlarım idi, necə deyərlər, heç ələ düşmürdüm), Əlibaba müəllim də məndən inciməsin, mən oğlumun toyuna Aşıq Şakiri gətirəcəm. Özü də xanəndələrdən də dəvət edəcəm. Gərək xanəndələr mənim oğlumun toyunda iştirak eləsinlər". Doğrudan da, bizim hamımızı dəvət elədi. Mən də bir 20 nəfər dost-aşnamla həmin toya gəldim. Gəldim gördüm ki, budur, Aşıq Şakir gözəl formada, şux geyimində dayanıb ayaq üstə, oxuyur, nə oxuyur. Üz-gözündən, kürəyindən tər tökülür. Hiss edirsən ki, məclisin gözəl məqamlarıdır. Məni görən kimi gəldi, yaxınlaşdı və bir qədər nigarançılıqla dedi: "Sən də gəlmisən toya?! Tərs kimi mənim də səsim o qədər də yerində deyil. Heç bilmirəm necə olacaq..."

Onun bu təvazökarlığı qarşısında bilmədim nə edim. Dedim: "Mən səni imtahan eləməyə gəlməmişəm. Sənin kimi böyük aşığa böyük hörmətim var. Mən bura adi bir dinləyici kimi gəlmişəm. Gəlmişəm ki, sənə böyük həvəslə qulaq asam, sənin oxumalarından zövq alam". Belə də oldu... Aşıq Şakir sazı sinəsinə sıxıb məclisdə bir dövran vurdu, fırlandı, dolandı, gəl görəsən. Sonra başladı bir "Zəminxarə" oxudu – o, kiçik bir muğamdı – onu nə təhər, nə təhər gözəl oxudusa, inanın, elə bil ki, məclis tamam yatdı, toy əhli dərin düşüncələrə qərq oldu. Aldığımız bu böyük, əvəzsiz zövqə cavab ifadəsi olaraq, hamımız cibimizdən 3-4 yüzlük çıxardıq. Gəlib aşıqlara xas olan bir əda ilə, həmçinin razılıq əlaməti olaraq əlimizin üstündən vurdu və hər kəsdən çox yox, cəmi bircə yüzlük götürdü... Gözü-könlü tox adam idi... Sonra da mənə üz tutub gülümsər halda: "Gərək məni bağışlayasan", – dedi.

Bununla demək istəyirdi ki, öz könlümcə, ürəyim istədiyi kimi oxuya bilmədim... Amma əslində belə deyildi. Əksinə, Şakir daha gözəl oxudu. Əgər oxumasından özü o qədər də razı qalmamışdısa, bu, onun özünə, öz sənətinə qarşı həmişə yüksək tələblə yanaşmasından irəli gəlirdi. İndi qayıdım sözümün əvvəlinə.

Şakir gəlib dayandı mənim qarşımda və öz oxumasından razı qalmayıbmış kimi: "Gərək məni bağışlayasan", – dedi.

Mən də gülümsəyib:

– Ay səni, öyüvəcən, – dedim, – gərək sən bizi bağışlayasan. Heç bilirsən ki, necə gözəl oxudun?! Əksinə, çox-çox gözəl oxudun!

Bax, Aşıq Şakir belə aşıq idi, həm də gözəl xanəndə idi. Ürəyi istədiyi vaxt, yeri gələndə muğamlara çox məharətlə müraciət edirdi. Aşıq Şakir sənətin zirvəsində dayanan və heç vaxt unudulmayan sənətçilərimizdəndir.

Məmməd RƏZZAQI

# ZƏNCANLI AŞIQ MÜSLÜM ƏSGƏRİ



Aşıq Müslüm Əsgəri 1938-ci ildə Zəncanın Badamıstan kəndində anadan olub. İlk təhsilini kənddəki məktəbdə alıb. 1952-ci ildə təhsilini davam etdirmək üçün Zəncan şəhərinə gəlib, Usul-i Kafini bitirib. O illərdə artıq İranda şah rejiminə qarşı mübarizə başlamışdı və Aşıq Müslüm də başqa siyasi-inqilabi çalışqanlar kimi SAVAK tərəfindən məhdudiyyətlərə məruz qalırdı. Bir neçə dəfə sürgün olunandan sonra nəhayət Zəncanın Tovfiq ilə Şəriəti mədrəsələrində təhsilini davam etdirib, ədəbiyyat sahəsində diplom alır. Ancaq Aşıq Müslüm inqilabi fəaliyyətlə məşğul olduğundan heç bir dövlət idarəsində çalışa bilmir.

Aşıqlığa 1967-ci ildə başlayan Müslüm Əsgəri bu sənətin əsas təlimini atası Aşıq Söhrabdan öyrənib. Müstəqil aşıq kimi ilk dəfə Tarımın Hindi kəndində toy məclisi aparan aşıq Müslüm Əsgərinin sorağı Zəncanın ünlü aşığı kimi tezliklə ətraf vilayətlərə də yayılır və onu Şərqi Azərbaycan, Qərbi Azərbaycan, Gilan, Xalxal, Tehran və Qumda toylara, el şənliklərinə dəvət olunur.

Ustad aşıq həm də bir çox dastanlarımızın mahir bilicisidir. İndiyədək onun dilindən 30 dastanı yazıya almışam və yaxın gələcəkdə bunu kitab halında nəşr etdirməyi nəzərdə tuturuq. Aşıq Müslüm yaradıcı

aşıqdır. 1980-ci ildə "Mirzə Kazım" adlı dastan yaradıb, eyni zamanda şeirlər də yazır.

Aşıq Müslüm Əsgərinin indiyədək 130 kaseti işıq üzü görüb ki, bunun da 120-si tərəfimizdən toplanaraq qorunmaqdadır.

O, İranda, Türkiyədə, Azərbaycanda və Şimali Kiprdə keçirilən bir sıra beynəlxalq festivallarda iştirak edərək mükafatlar qazanıb.

***Aşıq Müslüm Əsgəri***

## ÜRƏYİMDƏDİR

Hörmətli elimin arzularını
Hər zaman sevirəm, ürəyimdədir.
Başı yaşıl yaylaqları gəzəndə,
Həsrətim də odlu diləyimdədir.

Quşların səsinə oyanan ellər,
Bülbül nəğməsinə sevinən güllər,
Lala yanaqlarda danışan dillər
Əzilib bal kimi, çörəyimdədir.

Bu şanlı vətənim, ölkəm, mahalım,
Qurtulsun möhnətim, getsin məlalım.
Səndədir şövkətim, səndə cəlalım,
Ağzımda dilim tək gərəyimdədir.

Əlimdə qələmim, köksümdə sazım,
Atalar, analar mənim murazım.
Sinə dəftərində dilimlə yazım,
Elimin qüvvəti biləyimdədir.

Çıxartma yadından bu şən elləri,
Sənə əmək verən yaşıl çölləri.
Vətən aşığıyam – Müslüm Əsgəri,
Qəhrəman oğullar kürəyimdədir.

# AŞIQ MƏMMƏDAĞA BABAYEVİN 80 İLLİK YUBİLEYİ QEYD OLUNDU



2013-cü il iyunun 29-da Rəşid Behbudov adına Azərbaycan Dövlət Mahnı Teatrında Mədəniyyət və Turizm Nazirliyi və Azərbaycan Aşıqlar Birliyinin birgə təşkilatçılığı ilə aşıq **Məmmədağa Babayevin** 80 illik yubileyi qeyd olunub. Tədbiri giriş sözü ilə Azərbaycan Aşıqlar Birliyinin sədri, Xalq şairi **Zəlimxan Yaqub** açaraq Şirvan aşıq məktəbindən söz açıb. Bildirib ki, bu məktəbin bir çox görkəmli nümayəndələri olub. Onlardan biri də aşıq Məmmədağa Babayevdir. O, ötən əsrin altmış-yetmişinci illərində tanınmış istedadlı sənətkarlardan biri kimi respublikada şöhrət tapıb, gözəl ifaçı və yaradıcı sənətkar kimi tanınıb.

Sonra Azərbaycan professor **Məhərrəm Qasımlı,** professor **Seyfəddin Qəniyev,** İqtisad Universitetinin professoru **Babaxan Niyazlı** və başqaları sənətkarın mənalı ömür yolundan, zəngin yaradıcılıq axtarışlarından söz açıblar.

Çıxışlarda həmçinin vurğulanıb ki, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetini bitirən Aşıq Məmmədağa uzun illər Şamaxıda "İncə tellər" aşıqlar ansamblına rəhbərlik edib. Bu gün Şamaxıda mərkəzi küçələrdən biri mərhum aşığın adını daşıyır...

Yubiley tədbirində xanəndələrdən **Abgül Mirzəliyev, Elbrus Niftəliyev, Ağapaşa Xəlilov,** aşıqlardan **Ağamurad Şirvanlı, Yanvar Bədəlov, Altay Məmmədli, Ramin Qarayev, Əli Tapdıqoğlu, Elman Talıstanlı**, Təbriz aşıqlarından **Əsgər Məhərrəmi** və **Əbdüləli İsgəndəri**, "**Buta**" və "**Misri**" sazçı qrupları, aktyorlardan **Elnar Qarayev, Şəhla Əliqızı** və başqaları maraqlı çıxış və ifaları ilə tədbir iştirakçılarının zövqünü oxşayıblar.

Tədbirin sonunda Aşıq Məmmədağa Babayevin bacısı **Səmayə Babayeva** çıxış edərək bu tədbirin keçirilməsində zəhməti olan hər bir kəsə öz dərin minnətdarlığını bildirib...

***

İyulun 11-də Şamaxı rayon Mədəniyyət evində də **Aşıq Məmmədağa Babayevin** 80 illik yubileyi qeyd olunub. Professor **Məhərrəm**

**Qasımlının** aparıcılığı ilə keçən tədbirdə giriş sözü ilə çıxış edən Şamaxı rayon İcra Hakimiyyətinin başçısı **Asif Məmmədov** Aşıq Məmmədağa Babayevin həyat və yaradıcılıq yolundan söhbət açıb, sənətkarın yubileyinin Bakıda da qeyd olunmasını minnətdarlıqla qeyd edərək bunun eyni zamanda Şirvan aşıq mühitinə verilən yüksək qiymət olduğunu vurğulayıb.




Professor **Seyfəddin Qəniyev**, Azərbaycan Aşıqlar Birliyinin katibi, "Ozan dünyası" jurnalının baş redaktoru **Musa Nəbioğlu**, folklorşünas alimlər **Elxan Məmmədli, Qalib Sayılov** və **Əlirza Sayılov,** Hacıqabul RİH başçısının birinci müavini **Sahib Aslanov** və şəxsi təşəbbüsü ilə Bakıdakı mənzilində Aşıq Ələsgər adına aşıq muzeyi yaratmış **Hüseyn Göyçəli (Həsənov)** Aşıq Məmmədağa Babayevlə bağlı xatirələrini danışdılar, yaradıcı aşıq kimi sənətkarlığından söz açıblar.

Xalq artisti **Mələkxanım Əyyubova**, aşıqlardan Əməkdar mədəniyyət işçiləri **Əhliman Rəhimov** və **Ağamurad İsrafilov, Yanvar Bədəlov, Məhəmməd Şirvanlı, Vüqar Mahmudoğlu, Əli Tapdıqoğlu, Elman Talıstanlı,** gənc **aşıqlar Babək Şakirli, Rza Məmmədov, Asəf Qobustanlı** və **Elşən Təkləlinin**, eləcə də "**Misri**" sazçı qrupunun çıxışları tamaşaçılar tərəfindən rəğbətlə qarşılanıb.

Sonda Aşıq Məmmədağanın **bacısı Səmayə Babayeva** çıxış edərək tədbirin təşkilatçılarına ailələri adından dərin minnətdarlığını bildirdi.

Tədbirdə Mədəniyyət və Turizm Nazirliyinin əməkdaşları **Fikrət Babayev** və **Rəşad Əliyev** də iştirak ediblər.

**Elşad Çobanlı**

## XALQLARIMIZIN MƏNƏVİ VƏHDƏTİ – AŞIQ-OZAN SƏNƏTİ

İyulun 10-da Beynəlxalq Mətbuat Mərkəzində Azərbaycan Respublikasının Prezidenti yanında QHT-lərə Dövlət Dəstəyi Şurasının yardımı və "Aşıq Şəmşir Mədəniyyət Ocağı" İctimai Birliyinin təşkilatçılığı ilə "Azərbaycan-Türkiyə mənəvi birliyinin simvolu – aşıq-ozan sənəti" mövzusunda konfrans keçirilib.

Konfransda çıxış edən Azərbaycan Aşıqlar Birliyinin sədri, Xalq şairi Zəlimxan Yaqub aşıq-ozan sənətinin Azərbaycan-Türkiyə dostluq və qardaşlığının mədəni və mənəvi tellərinin araşdırılması baxımdan mühüm yeri olduğunu bildirib, bu mövzuda tədbirlərin əhəmiyyətini vurğulayıb. Qeyd olunub ki, aşıq-ozan sənəti xalqlarımızı, tarixi köklərimizi, adət-ənənələrimizi bir-birinə daha da yaxınlaşdırır.

Tədbirdə çıxış edən ziyalılar bildiriblər ki, ozan-aşıq sənəti xalqın həm mənəvi, həm də ictimai-sosial baxımından arzu və istəklərini ən gözəl və ən dolğun ifadə edə bilən sənətdir.

## AŞIQLARIMIZ FRANSADA ÇIXIŞ EDİBLƏR



Azərbaycanın Şirvan bölgəsinin aşıqları ölkəmizin Fransadakı səfirliyinin dəstəyi ilə Sen Floran şəhərində "Şərq" beynəlxalq mahnı festivalı çərçivəsində geniş konsert proqramı təqdim ediblər. Fransız musiqisevərləri aşıq musiqisinə böyük maraq göstərib, aşıq Əlinin ifasını alqışlarla qarşılayıblar. Aşığı Şirzad Fətəliyev (balaban), Şəmsi Fətəliyev (nağara) və Şöhrət Alıyev (qoşanağara) müşayiət edib.

Konsertdə şəhərin meri və Fransanın keçmiş xarici işlər naziri Herve de Şaret və xanımı, şəhər ictimaiyyətinin nümayəndələri, yerli jurnalistlər və çoxlu sayda digər qonaqlar iştirak ediblər. Tamaşaçılar ifaçıların çıxışını yüksək qiymətləndirib, onların yaxın vaxtlarda yeni bir konsert proqramı ilə Fransaya səfər etmələrini arzulayıblar.

Yerli JET FM radiosunun təşkil etdiyi canlı yayımda Azərbaycan mədəniyyətinin zənginliyindən danışılıb, fransızların xalqımıza məxsus muğamı yaxşı tanıdıqları və sevdikləri diqqətə çatdırılıb, bu ölkədə bir o qədər də tanınmayan aşıq sənəti və musiqisi barədə məlumat verilib, aşıq mahnıları səslənib, "Sarı gəlin" xalq mahnısı ifa olunub.

Sonda festivalın təşkilatçısı Alan Veber aşıq musiqisindən ibarət maraqlı konsert proqramının təşkilinə dəstək verən Azərbaycanın Fransadakı səfirliyinə öz təşəkkürünü bildirib.

# AŞIQ ƏKBƏR CƏFƏROVUN 80 İLLİK YUBİLEYİ QEYD OLUNDU



Sentyabrın 30-da Azərbaycan Dövlət Mahnı Teatrında Mədəniyyət və Turizm Nazirliyi və Azərbaycan Aşıqlar Birliyinin təşkilatçılığı ilə Əməkdar mədəniyyət işçisi, ustad aşıq Əkbər Cəfərovun 80 illik yubileyi qeyd olundu.

Aşıqlar Birliyinin sədri, Xalq şairi Zəlimxan Yaqub tədbiri açaraq aşıq Əkbər Cəfərovun yaradıcılığından söhbət açdı. Bildirdi ki, XX əsr Azərbaycan aşıq sənətinin görkəmli nümayəndələrindən olan Əkbər Cəfərov 1933-cü ildə Tovuz rayonunun Bozalqanlı kəndində anadan olub. El sənətkarı dəfələrlə Bakıda və Moskvada keçirilən festivalların iştirakçısı və qalibi olub. Əkbər Cəfərov aşıq şeirinin gəraylı, təcnis, divani, müxəmməs və s. növlərində yüzlərlə gözəl örnək yaratmış sənətkardır.

Tanınmış folklorşünas alim, professor Məhərrəm Qasımlının aparıcılığı ilə keçən gecədə professor Qəzənfər Paşayev, Əməkdar mədəniyyət işçisi, Prezident təqaüdçüsü aşıq İsfəndiyar Rüstəmov, sənətkarın dostu aşıq Çopur Ələsgər, folklorşünas Məhəmmədəli Məşədiyev və başqaları çıxış edərək aşığın çoxşaxəli yaradıcılığından, ifaçılıq məharətindən söz açdılar. Bildirdilər ki, Aşıq Əkbər Cəfərov həm də yaradıcı sənətkar idi. O, sənətinin çiçəkləndiyi bir vaxtda - 1990-cı ildə 57 yaşında vəfat edib.

Tədbirdə aşıqlardan Mahmud Məmmədov, Qələndər Zeynalov, Samirə Əliyeva, Altay Məmmədov, Ramin Qarayev, Həsən Babayi, Məhərrəm Hüseynli, Elməddin Məmmədli, Şəhriyar Qaraxanlı və başqaları çıxış etdilər.

Sonda Aşıq Əkbərin oğlu Arif Cəfərov çıxış edərək sənətə və sənətkara göstərilən diqqət və qayğıya görə ölkə Prezidentinə, Mədəniyyət və Turizm Nazirliyinə, Azərbaycan Aşıqlar Birliyinə və tədbir iştirakçılarına öz təşəkkürünü bildirdi.

## YENİ NƏŞRLƏR




**Borçalı folklor örnəkləri**, 1-ci kitab, Bakı, "Elm və təhsil" nəşriyyatı, 2013. 328 səh.

Azərbaycan MEA Folklor İnstitutunun nəşr etdirdiyi *"Azərbaycan folkloru antologiyası"* silsiləsindən olan bu cildə tarixi Azərbaycan mahallarından olan Borçalıdan toplanmış folklor örnəkləri daxil edilmişdir.

Kitabı toplayanlar professor Valeh Hacılar və filologiya üzrə fəlsəfə doktoru Elxan Məmmədli (E.Məmmədli həm də kitabın tərtibçisidir), redaktoru professor Mahmud Allahmanlı, rəyçilər isə professor Seyfəddin Qəniyev və filologiya üzrə fəsləfə doktoru Qalib Sayılovdur.




**Borçalı folklor örnəkləri**, II kitab (Dastanlar), Bakı, "Elm və təhsil" nəşriyyatı, 2013.

AMEA Folklor İnstitutunun nəşr etdirdiyi bu cildə Azərbaycanın tarixi mahallarından olan Borçalının ayrı-ayrı aşıq və el şairlərinin vaxtilə yaratdıqları dastanlar daxil edilmişdir. Klassik dastan yaradıcılığı ənənələrini özündə sənətkarlıqla əks etdirən bu nümunələrin geniş oxucu kütləsi üçün də maraq doğuracağına əminik.

Kitabın tərtibçisi və çapa hazırlayanı Əməkdar Mədəniyyət İşçisi, tanınmış folklorşünas alim, filologiya üzrə fəlsəfə doktoru Elxan Məmmədli, redaktoru professor Mahmud Allahmanlı, rəyçilər isə filologiya üzrə elmlər doktorları Seyfəddin Qəniyev və Seyfəddin Rzasoydur.




**Əzizxan Tanrıverdi**. “Dədə Qorqud kitabı”nın obrazlar aləmi. Bakı, “Nurlan”, 2013, 392 səh.

“Dədə Qorqud kitabı”nın obrazlar aləmi” filologiya üzrə elmlər doktoru, professor Əzizxan Tanrıverdinin “Dədə Qorqud”un dilinə hərs etdiyi səkkizinci kitabdır. Monqrafiyada qəhrəman, at və dağ obrazları, dilin funksiyaları, emotiv intonemlər və s. tarixi-linqvistik müstəvidə tədqiq edilir. Türk-Oğuz cəmiyyətində ata münasibət – at oğuldur, at qardaşdır, at qəhrəmandan üstündür, eləcə də, dağ ucalıqdır, hamidir kimi məsələlər təkcə “Kitab”ın poetik strukturu yox, həm də digər mənbələr kontekstində araşdırılır.

Kitabın redaktoru professor Muxatar Kazımoğlu (İmanov), rəyçilər professorlar Ramazan Qafarlı, Ramiz Əskər, Məhərrəm Məmmədli, filologiya üzrə elmlər doktoru Seyfəddin Rzasoy və İlham Abbasovdur.

Azərbaycan Milli Elmlər Akademiyası Folklor İnstitutunun nəşr etdirdiyi bu kitab “Dədə Qorqud” eposunun elm aləminə bəlli olmasının 200 illiyinə həsr olunub.




**Şair Nəbi Borçalı.** Sığındım Mövlaya. Bakı, “Çıraq” nəşriyyatı, 2013, 248 səh.

Azərbaycan Respublikası MEA Folklor İnstitutunun nəşr etdirdiyi bu kitabın toplayanı Hüseynqulu Məmmədli, tərtib edəni və çapa hazırlayanı filologiya üzrə fəlsəfə doktoru, Əməkdar Mədəniyyət İşçisi Elxan Məmmədli, redaktoru filologiya üzrə fəlsəfə doktoru Fəxrəddin Salim (Baxşəliyev), rəyçiləri filologiya üzrə elmlər doktoru Seyfəddin Qəniyev və Folklor İnstitutunun dissertantı Arzu Bayramlıdır.




**Vəli Xuluflu.** El aşıqları, Bakı, “Elm və təhsil” nəşriyyatı, 2013. 92 səh.

“Azərbaycanı Öyrənən Cəmiyyət”in 1927-ci ildə nəşr etdirdiyi “El aşıqları” toplusu Azərbaycan Milli Elmlər Akademiyası Folklor İnstitutunun “Azərbaycan folklorunun ilkin nəşrləri” seriyasının VII kitabı kimi işıq üzü görüb.

Azərbaycan MEA-nın Folklor İnstitutunun Elmi Şurasının qərarı ilə nəşr olunan kitabın redaksiya heyətinin üzvləri Muxtar Kazımoğlu (İmanov), İsrafil Abbaslı, Rza Xəlilov, Maarif Teymurov, transliterasiya edənlər və çapa hazırlayanlar Rza Xəlilov, Afaq Xürrəmqızı, elmi redaktoru İsrafil Abbaslıdır.

**Aşıq Gülabı Xındı Məmməd oğlu.** Mən olmayanda. Bakı. “Elm və təhsil”, 2013. 112 səh.




Aşıq Gülabı Xındı Məmməd oğlunun oxuculara təqdim olunan “Mən olmayanda” adlı kitabı müəllifin yeganə kitabıdır ki, vəfatından sonra çap olunur. Kitaba aşığın əldə olan bir sıra gəryalı, qoşma və divaniləri daxil edilmişdir. Kitabda həmçinin oxucular bir sıra qələm adamlarının aşığa həsr edilmiş şeirləri ilə də tanış ola biləcəklər.

AMEA Folklor İnstitutunun nəşr etdirdiyi kitabın redaktoru, tərtibçisi və çapa hazırlayanı Əməkdar Mədəniyyət İşçisi, tanınmış folklorşünas alim, filologiya üzrə fəlsəfə doktoru Elxan Məmmədli, toplayanı Şahin Gülabı oğludur.




**Aşıq Əşrəf Qəni.** Buludlar ağlayır (şeirlər və poemalar). Bakı, “Nurlan”, 2013, 104 səh.

AMEA Folklor İnstitutunun nəşr etdirdiyi bu kitaba daxil olan şeirlər Aşıq Əşrəf Xındı Məmmədoğlunun yaradıcılığından seçilmiş nümunələrdir. Müəllifin sağlığında görə bilmədiyi ilk kitabına aşıq şeirinin əksər janrlarını əhatə edən şeirləri, müasir üslubda yaratdığı poeziya nümunələri və iki poeması daxil edilmişdir.

Kitabın redaktoru Ramiz Kərəm, tərtib edəni və nəşrə hazırlayanı isə Elxan Məmmədlidir.

**Mövlud SÜLEYMANLI**
**Xalq yazıçısı**



# YER ÜZÜNƏ MƏKTUB...

*(əvvəli 4(11) 2012-ci il, 1(12) və 2(13) 2013-cü il tarixli saylarımızda)*

### Toy adətlərimizdən – Şax ağacı...

Qərbi Azərbaycan bölgələrində toyun ikinci günü, günortadan sonra qız evində "Şax" bəzədilərdi. "Şax" nədir? Əslində dağdağan ağacından düzəldilir. Piramidaya oxşar quruluşu olur, gövdəsinə elə dağdağan ağacının budaqlarından asılqanlar quraşdırılır. Aşağıdan iki adam üçün tutacaq qoyulur. Oğlan bəyinin sağdışı-soldışıyla qız bəyinin sağdışı-soldışının hədiyyələri, sovqatları, qohum-qonşuların verdikləri paylar bu asılqanlardan asılır. "Şax"ın götürülmə vaxtı axşam üstüdü, "Şax ağacı" qız evindən elə vaxt çıxarılardı ki, yolun yarısında işıq lopaları yandırılsın, toy evinə işıq lopalarıyla çatsınlar. İşıq lopaları da gilas ağacının qabığından düzəldilirdi. Əsas məsələlərdən biri oydu ki, "Şax" qız evindən oğlan evinə təzə yolla getməliydi, yəni, hamının getdiyi yolla yox, təzə cığır salınmalıdır ki, qız bəyi ər evində qayım-qədim olsun, şeytan geri qayıtmağına yol tapa bilməsin, yol göstərəmməsin...

Adətə görə, "Şax ağacı"na bələdçi seçilərdi. Bələdçi də "Şax ağacını" başının dəstəsiylə bir yerdə bəy evinə ayrı yolla aparmalıdır, divardan aşırır, hasarlardan keçirir, qız da başının dəstəsiylə "Şax ağacı"nın ardınca toy evinə yollanırlar... Nə qədər gec çatsalar, nə qədər uzun yol getsələr o qədər yaxşı sayılardı. "Şax" yolunun öz qaydaları olduğundan unudulmaz tamaşalar göstərilir ki, təzə toyluların ömürləri boyu danışılsın.

"Şax"ı hər toy yiyəsi öz imkanına, adına görə bəzəyərdi, yəni adla söylənərdi ki, filankəs gözəl "Şax" bəzəmişdi, məsələ təkcə sovqatlarda deyildi, təntənəylə gətirilməyindəydi; "Şax ağacı"na dediyim kimi, *bələdçi, qoruqçu* seçilirdi. Qoruqçu da özünün dəstəsini yığırdı ki, "Şax ağacını" bütövlükdə qoruya bilsin. Ona görə ki, "Şax"ın yağmalanmağına-talanmağına izin verilirdi: Gəlini də onun sağdış, soldışını da

oğurlayıb nəmər-sovqat alıb qaytarmaq adətdəndi... Bu da bir tamaşaydı, bununla belə, adətə görə, kim bacararsa, "Şax ağacı"ndan istədiyini götürə bilərdi. Amma qoruqçu dəstəsinin qamçısına heç kim yaxın düşə bilməzdi... Bu arada **nayğara** deyilən adamlar, yəni **güldürücülər** "Şax"ın önünə çıxırdı, Qız bəyini (gəlini) kim güldürərdisə, istədiyi payı ala bilərdi... "Şax" çal-çağırıyla təzədən yoluna düzələrdi, hansı məhlədəsə yenə yolunu kəsərdilər. Bələdçi irəli çıxıb so*ruşar:*

-Nə istəyirsən?!

-Güləş havası çalınsın. Güləşmək istəyirəm.

Güləş havası çalınır, şaxın qoruqçu dəstəsindən güləşçi çıxır, Qoruqçu meydanı genəldir, "Güləşəngi" havası altında görünməmiş bir güləş baş tutur... Ona görə də el arasında belə deyim, ifadə yaranıb: "Elə bil şah güləşçisi idi..." Əvvəl hesab edirdim ki, "şah" sözü burda "padşah" mənasındadır. İndi mənə elə gəlir ki, "Şax ağacı"nın güləşçisi kimi anlasaq daha düz olar...

"Şax"ın güləşçisi udardısa, yol açılardı, uduzardısa, şaxdan **nəmər-mükafat** verməliydilər...

"Şax ağacı"nın yanından qız oğurlamaq-qaçırmaq adəti də var, daha doğrusu, adətdi, qız bəyini oğurlayıb gizlədirlər ki, bahalı hədiyyələr alıb yerini desinlər. Ona görə "Şax ağacı"na bələdçiylə yanaşı gizlincə çuğul da seçilir; qız bəyi itəndə çuğul kəndi bir-birinə qatıb oğlan evinə xəbər göndərir ki, filan yerdədi. Oğlan bəyinin başının dəstəsi həmin qapıya gedib qız bəyini sazla-sözlə istəyirlər:

*Bizdən salam olsun nazəninlərə,*
*Verin qız bəyini, yar bizimkidi.*
*Çuğul söz gətirdi, oyun oynadı,*
*Yardan xəbərimiz var, bizimkidi.*

Qızlar istəyirlər yox, deyib işi bir az da bərkitsinlər:

*Başına döndüyüm el igidləri,*
*Varın gedin burdan, yar sizin deyil.*
*Gözəllər toruna düşüb qalarsız,*
*Gedib çatammazsız, yol sizin deyil...*

Qızlar görürlər ki, oğlanlar əl çəkmir, bütün el-oba da axışıb bura, hamı bu zarafatın, bu oyunun içindədi; biri qızı ver deyir, biri vermə deyir. Sonda oğlan evi yeyib-içməyə bir qoç boyun olur. Qız bəyini gizlədənlər bu sözlərlə qızı verirlər:

*Gözünüz yoldadı, könül səsdədi,*
*Qaşları qələmdi, ağzı püstədi.*
*Yığval ətəyidi, muraz üstədi,*
*Alın gedin oğlan, yar sizinkidi...*

Bu cür toy tamaşalarının, zarafatlarının içindən keçə-keçə gəlib çatırlar toy evinə; "Usta çal" havasıyla gəldiklərini bildirirlər, şənlik şənliyə qarşır, saz-saza...

"Şax" adamları (obrazları) *Bələdçi*, Q*oruqçu, Nayğara, Çuğul* başına gələnləri gülməli şəkildə, biz sizə necə danışdıq eləcə, oynaya-oynaya bəzəyib-düzəyib danışıb toy adamlarını əyləndirirlər. Danışdıqları da beləcə, yüzilliklərə addayır... Bu obarazlar – "Şax ağacı"nın adamları çox vaxt dəyişdirilmir, elin-obanın toyunu-şənliyini onlar idarə edir; sağdış, soldış dəyişdirilir, onlar yox...

***

Böyük türk tədqiqatçısı Ziya Göyalp "Türk mədəniyyəti tarixi" kitabında yazır: "Avropa tədqiqatçısı Grenar, Çin Türkistanında ailə qurmaq-evlilik törənlərini üç cür işləyərək toplamışdır:

a) Güvey, (*Azərbaycan türklərində kürəkən, yeznə, göyü, giyov)* dostlarıyla birlikdə qayınbabasının (*bizdə qaynata)* evinə gedərlər, indi mənası bilinməyən "Hay, Hay evlənin! Hay evlənin" mahnısını oxuyarlar. Qızın atası onları qapıda çörəklə qarşılayar, sonra onları təntənəylə evə dəvət edər, oğlanın boynuna bir yazma-şərf dolayar, qızını ona təqdim edər. Tədqiqatçı Grenar belə hesab edir ki, bununla da, yəni yazmanın oğlanın boynuna salındığıyla qızın üzərində olan atalıq haqqının artıq oğlana keçmiş olduğu bildirilir... Bundan sonra bir qab su gətirilir, oğlanla qızın ata-anası su qabında çörək isladıb nişanlılara verirlər. Bu da o deməkdir ki, qız artıq ata evini tərk edə bilər.

b) Qızı ata evindən qızın qadın qohumları ağlaya-ağlaya yola salarlar.

Kazaklarda qonşu oğlanlar bizdə olduğu kimi yolu kəsib bəy evindən "Torpaq basdı" istəyərlər. Bəyin boynuna salınmış yazmanı-şərfi oğurlamağa çalışarlar. Kürəkən yazmanı verməmək üçün pul-para xərcləyir....

Bəy evinə çatanda qızı xalça üzərində aparırlar, çünki qızın ayağı ilk qədəmində bəy evinin həyətinə dəyməməlidir. İçəridə yanan bir ocağla üz-üzə qoyurlar, bu da Çin Türküstan türklərinə görə qızın ruh pərisinin oğlanın ruh pərisiylə tanışlığı üçündür.

c) İndiyə qədər bir-birini görməmiş olan bu iki pəri birdən-birə sevişməzlər. Ona görə də qaynanayla qaynata azı üç gün gəlini görməməlidir ki, bu iki gəncin könül pəriləri isnişə bilsinlər.

Sartlarla Qırğızlarda gəlin bu üç günü pərdə arxasında (bizlərdə gərdək) keçirir, ona yalnız bir qız arkadaşı qulluq edir. Üç gündən sonra üz açılması törəni başlayır. Qırğızlar buna "bet açar toy", Çin Türküstanında "üz açıqdır", Türkiyə türklərində "üz görümlüyü" Azərbaycan türklərində (əlavə mənimdir) "üz gördü"yə yığışıb hədiyyələr gətirirlər...

Ziya Göyalp bəy əfəndiyə görə də bütün bunlar iki gəncin sıxıntısını, utanmağını aradan qaldırmaq üçündür. Mən də bu fikirdəyəm...

***

Dədə-babadan qalma toy adətlərimiz həmişə bir adamın yaratdığına yox, təbiətin özünün yaratdığına bənzəyib, təbiətin dəyişilməz qanunu kimi qavranılıb. İndi toylarımızdakı sahmansızlıq özümüzdə olanları unutduğumuza görədir.

Vaxt, onu anladıq-anlamadıq, güclüdür, zəifləri öz havasına oynatmağı sevir... Sən min-min illərlə sınaqdan çıxartdığın inancları, işləri-işləkləri, adət-ənənələri atıb başqa – yad şeylərə cumanda özün də bilmədən vaxtın çaldığına oynayırsan. Vaxt gedir, Vaxt hərəkətdə olandı, onunçün də düşüncəsiz, sınanılmamış, haya-küyə aldanıb nə eləyirsənsə, bu günlükdür, sabaha qalmır. Bizim bu günkü toylarımızdan gileylənə-gileylənə qeybət etməyimizin səbəbi də budur. Bir zamanlar hər hansı bir toyu mövsüm kimi yaşayırdıq, ona görə ki, toyun ilki, ilk addımı elə mövsüm kimi başlayırdı; cücərirdi, göyərib-yaşıllanırdı, arınır-daranırdı, yetişib meyvəsini gətirirdi... Xalqın özünün yaratdığı ifadədir: "Toy-toyu gətirər..." "Bir toydan yüz toy çıxar" deyib. Düz deyib, təbiətdə də bir-birindən ayrı heç nə yoxdur. Bir kökdən min kök ayrılar, uzaqdan-uzağa sevgi havasına sevgi çiçəkləri açılar... İndiki kimi toylara az qala bir ay qabaqdan *dəvətnamələr* paylanmazdı. Qara zurnada "Sabah sazı" deyilən bir hava adında olduğu kimi, sabah-sabah çalınar, çalınan kimi də səsi çatan yeddi para kənd bilər ki, axşam filan yerdə toy var; tələsməz, qara zurna yenə nəsə deməlidir, indiki dilimizlə desək, toyun proqramını bildirməlidir.

**Saçın ucun hörməzlər; toy havaları...**

*(musiqili tamaşa üşün libretto)*

Qarazurnada "Sabah sazı" çalınır, çox zildə səslənən çağırış xarakterində olan bir havadır; mənasını bir cümləylə belə açmaq olar: "Gəl heeeeey...!" Kənd yerlərində indinin özündə də dəvətnamələr olmadığına görə, xeyir işlərə adamlar bu havayla çağırılır...

Orda-burda – həyət-bacalarda, bulaq başında, xalça dəzgahının üstündə, pəncərələrdən boylanan üzlərdə, bir-birinə doğru qaçan yeniyetmə qızların sevincində, həyəcanında bu havanı elə bu anlayışda da hiss edirik.

Ordan-burdan səslər eşidilir:

– Aaa, toydu? Nə yaxşı...!

– Kimin toyudu? Həmişə toyda...!

– Toya çağırırlar... ba-aax...

Alabəzək geyinmiş qızlar ordan-burdan çıxıb bir yerə yığışırlar... Yeddi qızdı, baş-başa verib qarazurnanı dinləyirlər.

– Hə, toydu, baax... bizi çağırırlar!

Qarazurna doğrudan da dil açıb, qaydalada-qaydalada, "Usta çal"ı havasıyla "toy var deyir", "gəlin, sizi gözləyirik", deyir...

Analar da görükür, toy havasını eşidib ayaqlarının ucuna qalxıb boylanırlar, qızlarını, oğlanlarını görürlər... Hamısı sevinc içindədi.

– Mübarəkdi, – deyirlər. – Subaylarımızçün olsun! Bəxtləri açılsın, gözlədikləri gəlsin...!

– Ərgən oğlanlarımız, ərlik qızlarımızçün olsun...!

– Subaylarımızçün olsun!

Oğlanlar da görükür, tamaşa-filmimizə uyğun hərəsi bir iş üstündə... (biri atını yuyur, biri maşından düşür, biri idman eləyir, biri qamçı hörür və s...)

Musiqi havası dəyişir, nağarada oynaq xırdalıqlar edilir və bunun nə demək olduğunu, nağara diliylə nə demək istədiyini adamların, daha doğrusu, artıq qəhrəmanlarımıza çevrilmişlərin üz-gözlərindən anlayırıq...

Oğlanların dilindən eşidirik:

– Aha, qızları da çağırdılar. Ba-ax... "Qız yallısı" çalındı.

Musiqi sədaları dəyişir, "Qız yallısı"nın başlanğıcı su səsinə oxşar lirik melodiyadı, elə bil üstümüzə axıdılır.

Qızlar doğrudan da bu çağırışı anlayıb musiqinin dediyinə uyğun, ritm altında süzə-süzə yığışırlar, səs onları çağırmaqda davam edır...

Görürük ki, bura bir toy evinin (Şadlıq sarayının) səhnəsidi.

Qızlar yallı cərgəsinə durublar...

Onların ora-bura boylanmağından nəyinsə çatmadığını, kimisə gözlədiklərini hiss edirik. Oğlanları gözləyərlərmiş...

Qarazurna da, nağara da elə bil onların nə istədiyini anlayır, havasını dəyişib yenidən səslənir, bu, yeni melodiyadı, bir az sərt, amma sahmanlı, səfərbər, hərbi marşlara bənzər... Oğlanları çağırırlar. Qızlar bunu anlayıb canlanırlar:

– Oğlanları da çağırdılar... Bax, nağara gəl, deyir.

Analar bir-birinə əl eləyir.

Filmin əvvəlində gördüyümüz adamlar, musiqini eşidib elə bil danışığa qulaq asırlar; oğlanların əllərindəki işlər əllərində qalıb; atını yuyan, maşından düşən, qamçı hörən... velosiped sürən, üzünü qırxan...

Musiqinin nə dediyini anlayıb gülümsəyirlər, əllərindəki işləri atıb, hamısı birdən nağara sədalarına uyğun hərəkətlərlə nizama düzülə-düzülə səsə gedirlər.

Onları da həmin toy evinin səhnəsində görürük...

Qızlarla yan-yana qatara düzülürlər...

Musiqi sədaları saz havasıyla əvəz olunur. “Almanı atdım xarala...” havası çalınır, musiqini eşidən kimi ordan-burdan səslər eşidilir...

...Hamı ara verib diqqətlə musiqini dinləyirlər.

-“Alma yalısı”...! – hamısı birdən sevinc içində qışqırırlar... – Alma yallısı olacaq! Deyin yallısı-ıı!

– Nə yaxşı, çoxdandı yox idi...! – Analar səs səsə verirlər: – Deyin yallısı-ıı...?!

Dinləyirlər...

Biri başını səs gələn tərəfə tutub...

– Mənim alma yallısına deyinim var.

– Mənim də...

– İstəyirəm oğlum “Deyin yallısı”nda qız seçsin...!

Yastı balabanda doğrudan da elə bil kimisə çağırırlar... Balabanda “Sarı gəlin” mahnısının sədaları eşidilir.

*Saçın ucun hörməzlər,*
*Sarı gəlin...*

Orta yaşlarında bir adam musiqini eşidib harasa qaçır, görünməz olur...

Onu qiyafəsini dəyişmiş halda görürük, milli geyimdə, çiyinindən qotazlı qamçı asılıb, əlində nağıllardan çıxmış kimi, qırmızıyanaq iri bir alma tutub.

Alma görünən kimi mahnı sədaları yenidən yayılır.

Səslər eşidilir:

– Saç hörüləcək...

Qızlar baş-başa verib sevindiklərini bildirirlər.

*Yara qurban, yara qurban,*
*Yara qurban olum...*

*Almanı al eylərəm,*
*Örpəyi şal eylərəm.*
*Tək yarım gələn olsun,*
*Yolları gül eylərəm...*

*Aşıq arada məni,*
*Tutma qarada məni...*
*Alma, qurbanın olum,*
*Çatdır murada məni...*

Qızlar oxuya-oxuya almaya tərəf gedirlər...
Oğlanlar da o biri tərəfdən oxuya-oxuya yaxınlaşırlar:

*Alma atana qurban,*
*Atıb tutana qurban.*
*Məxmər döşək, naz balış,*
*Yalqız yatana qurban...*

Yeddi oğlan yeddi qız oynaya-oynaya almanın önündə dua eləyirmiş kimi bir anlığa dayanırlar, əllərini yüngülcə almanın üstünə qoyub baş əyib keçirlər. Yallının ən qaynar vaxtıdı, Toybabası əlindəki qamçıyla istədiyi işarələri verir, bu işarələrlə yallı düzlənir, yeni nizam qurur, bükülür, açılır...

Oğlanlarla qızların rəqsləri tez-tez dəyişir, ritmik hərəkətlər bir-birini əvəz edir... Əlində alma tutmuş Toybəyinin qamçısının kəskin işarələriylə yallıdan yallıya keçirlər.

Qamçının səsi də nəsə demək üçündü, belə də anlaşılır, bu dəfə, qamçının səsi, dur, deyir, oğlanlar da, qızlar da dayanırlar... Toybəyi qamçısını oynada-oynada yenidən işarələr verir, budəfəki işarə sakitlik yaradır... Toybabası qamçısını boynundan asıb almanı ovcuna götürür, əllərini qoşalayıb irəli uzadır, sağda qızlar, solda oğlanlar, yallının arasıyla o biri başa keçir. Kəskin dönüşlə çevrilib almanı oğlan yallısının birincisinə atır... Alma kimin əlindən düşdü oyundan çıxmalıdı.

Bütün bu hərəkətləri musuqi sədaları izləyir, daha doğrusu, musiqi nə deyirsə, ona da əməl olunur.

Oğlan almanı göydə tutur, başının üstə qaldırır, sümüyə düşən bir havanı oynayırlar... Alma əldən ələ dolaşır, biri əlindən salır, tez də sıranı tərk edir, yerinə hazır olan bir başqası qatılır. Alma birinin əlində qərar tutur.

Qızlar üz-üzə əl çalmaqla ritm altında xırda hərəkətlərlə oynaya-oynaya oğlanları müşayət edirlər. Alqışlar musiqi sədalarına qarışır... Oğlan almanı hansı qıza atacaq, hamı narahatlıq içindədi, ən çox narahat olan da qızlardı...

Baxışırlar... alma ritmə uyğun olaraq sürətlə oğlan yallısı boyu əldən-ələ keçir... Bir neçəsinin əlindən düşür, almanı salanlar peşimançılıq içində dəstədən çıxırlar, tamaşaçılar arasında analar yenilərini – öz qızlarını, oğlanlarını hazır saxlayıblar, onları meydana ötürürlər, eyni ritmlə yeniləri qatılır. Qız yallısı hərəkətə başlayır, oğlanlara üz tutaraq:

*Ağ alma, qızıl alma,*
*Yallıya düzül, alma.*
*Vaxt keçdi, vədə gəldi,*
*Budaqdan üzül, alma...*

Oğlanlardan biri alma əlində bir addım irəli çıxır, oxuyur, yallı onu müşayət eləyir:

*Bağçalar bar gətirər,*
*Gül açar, bar gətirər,*
*Almam bəxt almasıdı,*
*Tez gedib yar gətirər.*

Oxuya-oxuya almanı seçdiyi qıza atır...

Hiss olunur ki, qız bunu gözləmirdi, alma əlini yandırırmış kimi o əlindən bu əlinə ötürür....

Nəqarət oxunur...

*Yara qurban, yara qurban...*
*Mən yara qurban olum,*
*Bağçada bir gül bitib,*
*Bu gülə qurban olum...*
*Yarım yallı boyunca,*
*Tez gələ, qurban olum...*

Yallı ortada üz-üzə dayanmış oğlanla qızın başına dolanır... Oğlan qızdan cavab gözləyir.

*Yara qurban, yara qurban,*
*Yara qurban olum...*

Qız almanı geri oğlana atır...

Hamı çaşqınlıq içində boylanır, oğlan diksinən təki olur, oğlan almanı tutub, kəskin hərəkətlərlə yallının başına dolanır, üzünü oğlanlara və Toybəyinə tutur:

*... başamı dəydi,*
*Tənə başamı dəydi?*
*Say aldım, saya seçdim,*
*Oxum daşamı dəydi?*

Nəqarət oxunur:

*Saçın ucun hörməzlər,*
*Gülü sulu dərməzlər,*
*Səni mənə verməzlər,*
*Neynim aman Sarı gəlin...*
*Ölsün nənən, Sarı gəlin...*

Oğlanlar da, qızlar da heç nə olmamış kimi yallını pozmadan hamısı bir yerdə əllərini irəli uzadıb oxuya-oxuya oğlanı rəqsə dəvət edirlər ki, buna da "Qamçıyla tək oyun..." deyirlər. Toybəyi qamçını oğlana atır, oğlan da almanı Toybabasına atır, qamçını tutub, qamçının eninə-uzununa bir-iki uyğun hərəkət edir, qamçıyla rəqsə başlayır. (Qamçı rəqsi)

Çox mənalarla dolu olan bu Qamçı rəqsi bitəndən sonra bütün musiqi alətləri səs-səsə verir, hərəsi öz dilində, öz ifadəsində deyir, daha doğrusu xahiş edir: barışmaq lazımdı, qızın istəyini anlamaq və barışmaq...

*Yara qurban, yara qurban,*
*Yara qurban olum...*

Nağara da xırdalıqlarıyla bunu tamamlayır... oğlan təzədən qıza yaxınlaşır, nəqarətin müşayətiylə.

*Aşıq nişana gəlməz,*
*Gedər nişana gəlməz,*
*Ovçu ovun seçməsə,*
*Oxu nişana gəlməz...*

Oğlan barışmaq üçün yaxınlaşır, qız bunu belə də anlayır, əlini ona doğru uzadır, oğlan indiyəcən dinlədiyimiz bütün musiqi alətlərinin

uyğun sədaları altında qızın əlini öpmək üçün əyilir, qız əlini çevirir, oğlan onun ovcundan öpür, yəni, biz qardaş bacı ola bilərik...Oğlan qızla qoşa oynaya-oynaya onu qızlar yallısına təhvil verir.

Biri almanı tuta bilmir, əlindən salır, musiqini də elə bil qəsdən saxlayırlar, melodiya kəsilir, bu da o deməkdi ki, almanı əlindən salan oyundan çıxmalıdı, həmin qız yallıdan çıxmalı olur.

*Yara qurban, yara qurban,*
*Yara qurban olum...*
*Gül əkdim yollarına,*
*Yar gələ, qurban olum...*
*Bu gül mənim gülümdü,*
*Bu gülə qurban olum.*

*Alma əldən ələ keçir, biz üz-üzə durmuş yallıda qızla oğlanın gizlicə gözləşməsinin şahidi oluruq. Qız oğlanın işarələrini anlayıb almanı ona atır, oğlan almanı alıb öpür, yenidən qıza atır, qız da almanı öpür, bununla da alqışsədaları yayılır...*

*Yara qurban, yara qurban,*
*Yara qurban olum,*
*Bu elin yazısıyla,*
*Qoyunlar quzusuyla,*
*Mən sənə hə, demişəm,*
*Tanrının yazısıyla...*

Oğlanla qız oynaya-oynaya dövrə vururlar, hər yandan onları təbrik edirlər, ətrafdan təbrik sədaları gəlir.

Oğlan qamçını Toybabasına qaytarır... Toybabası qamçının hərəkətləriylə işarələr edir, iki yallı bir olur; bir oğlan bir qız halında düzülürlər.

*Yara qurban, yara qurban,*
*Mən yara qurban olum...*

"Sarı gəlin" mahnısı oxunur:

*Səni mənə verərlər,*
*Sarı gəlin.*
*Gülü sulu dərərlər,*
*Saçın ucun hörərlər,*
*Qoy anan anam olsun,*

*Sarı gəlin,*
*Hörüyüm hörən olsun,*
*Sarı gəlin...*

Oğlanla qızı yuxarı başda oturdublar...

Gümüş qabda yuyulub silinmiş almanı gətirirlər, oğlan almanı götürüb qıza verir, qız almanı dişləyib oğlana qaytarır, oğlan da dişləyir... Toybabası qamçının qayışını oğlanın başına dolayır, qamçının sapı oğlanın boynunun ardına düşüb, qotazları alnında qəribə, amma əzəmətli bir görkəm yaradıb. Qızın hörüyünü açıblar, darayıb, ayırıb saçlarını yenidən oğlanın başına dolanmış qamçının qayışına hörürlər... Onlar – qız oğlan hörüklərinin ucları bir-birinə hörülmüş halda yanaşı oturub gülümsəyirlər. Yallı onların başına dolana-dolana oxuyur:

*Səni mənə verdilər, Sarı gəlin,*
*Gülü sulu dərdilər,*
*Saçın ucun hördülər,*
*Qoy anan anam olsun, Sarı gəlin...*
*Hörüyüm hörən olsun, Sarı gəlin...*

**Ağaclarımız...**

Eldə-obada deyərlər, dağdağan ağacı “pis gözü, pis nəzəri kəsir, qaytarır. Deyərlər, dağdağan su səsi eşidilməyən yerlərdə bitir. Tərəkəmələr **yarar** inəklərin boynundan dağdağan asarlar ki, göz dəyməsin. “Yarar” sözü aydın olsun deyə belə bir misal çəkim, deyərlər: “Filankəsin inəyi yarar inəkdi”, yəni, südü yağlıdı. Dağdağan həm də bəzək ağacıdı...

Nar ağacı el arasında istək, sevgi ağacıdı. Palıd, fındıq, arçan ağacları sayılan, seçilən ağaclar olub. Deyərlər, Arçan ağacının şirəsi dərdlərə dərmandı. Barama qurdunu Arçan ağacının tüstüsüylə sağaldarlar. Arçan ağacının ocağında bişən süd çürüyüb kəsməz. Bar saxlamayan ağacın dibinə paslı dəmir sancarlar. Yaz başı tumurcuq açmayan ağacı səksəndirməklə – qorxutmaqla sağaltmaq olur... Balta götürüb üstünə yüyür, – vurdum səni, de, amma vurma, azacıq yarala, sonra yarasına su tök, sarı, sığallaya-sığallaya de: niyə gəlmirsən de, ağac bacım, yeminmi az oldu, suyunmu az oldu, bax, hamı gəlib, sən də gəl! Beləcə de, gözlə, tumurcuqlayacaq.

Göyrüc ağacı inam ağacı sayılır.

El arasında “köp ağacı” deyilən ağac olur. Nar ağacının çubuğundan düzəlir, düzəldəndə gərək elə eləyəsən ki, çubuq torpağa toxunmasın. Mal-qara köpəndə bu çubuqla vura-vura qaçırdırlar...

Söyüd ağacının kölgəsi, deyərlər, meyvəsidi. Söyüd ağacının çubuğunu axmayan suya at, uzun müddət keçsə də iylənməz.

Təzə ağac basdıranda, təzə bostan əkəndə qayqanaq bişirirlər...

## Adamın nağılı...

Belə deyirlər ki, Adam yaxşı dolana bilmirmiş. Günlərin birində düşünür daşınır, deyir: – Gedib harda olur-olsun arayıb-axtarıb Allahı tapacam, soruşacam ki, məni niyə yaratmısan? Niyə eşitmirsən səsimi?

Elə bu fikirlə də evdən çıxır; az gedir, uz gedir, dərə-təpə düz gedir, dərələrdən sel kimi, təpələrdən yel kimi gethaget, iri bir armud ağacına rast olur, deyir: – Elə bunun altında dincəlim, qalxıb gedərəm...

Yenicə dincini alırdı ki, səs eşitdi, başını qaldırdı, heç kəs yox idi. Ora boylandı, bura boylandı, kimsəni görmədi.

“Bilirdim gələcəksən, səni gözləyirdim. Çox uzun çəkdi...” Başını qaldırdı, yenə heç kəsi görmədi. Səs ağacın içindən gəlirdi: – hə, mənəm, – dedi, Ağac. – Bilirəm Allahın yanına gedirsən, mənim də dərdimi deyərsən. Cavabsız gəlmə...

– Dərdin nədi, sənin?

– Meyvəmi saxlaya bilmirəm, neçə illərdi meyvəm qalmır, elə çiçəkdə tökülür. Allaha de, dərdimə əlac eləsin.

– Yaxşı, – deyib yola düzəlir.

Nağıl dili yüyrək olar; necə deyirlər elə, aranda ayla-illə, dağda küləklə-yellə, aşağıda yağışla-sellə, yolda şirin dillə, Allahı kimdən soruşur, gördüm, deyən olmur... gəlir bir kimsəsizliyə düşür.

“Hardasan, bilirsən gəlirəm, bə niyə görünmürsən?!” – fikrində Allahla danışa-danışa gəlirdi, gördü təpənin başında bir Bozqurd quyruğu üstə şöngəyib onu gözləyir.

– Oturub səni gözləyirəm, – dedi, Bozqurd. – Bilirdim gələcəksən, Allaha deyərsən, başım ağrıyır, ulaya-ulaya qalmışam, bir çarə eləsin.

– Yaxşı, – dedi, Adam – gözlə burda, cavabını gətirərəm.

Az getdi, çox getdi, dərə getdi, dağ getdi, qara getdi, ağ getdi, sol getdi, sağ getdi, günəşli isti bir gündü, iri damcılı ağ yağış başladı. Adamın ürəyinə damdı ki, Allah buralardadı, hardaymışsa yağışla gəlib çıxıb. Yan-yörəsinə baxdı, nə vardısa hər şey, – ot, çiçək ayağının ucuna qalxmışdı, ılıq, işıqlı, ağ yağışa – Allaha yəni, dartınırdı. Adam da ayağının ucuna qalxdı, Yağışdan səs gəldi, ağyağış Allahın səsini gətirmişdi:

– Ey Adam, sənin qismətini verdim, hardan gəlmisən ora qayıt. Ağaca de ki, dibində **yatır** (xəzinə) var, onu çıxartdırsın, sağalacaq. Bozqurda de ki, yanına bir axmaq adam gələcək, onun beyini dərmanındı. Get,

Adam, elə beləcə de. Sənin qismətini anadan olanda da vermişdim, görmədin qismətini, indi görərsən, get qismətin qarşına çıxacaq...

Adam sevinə-sevinə, daha doğrusu, tələsə-tələsə getdiyi yolu qayıdırdı ki, qismətinə çatsın. Armud ağacı onu gözləyirdi, görən kimi yüz yerindən gərildi:

– Noldu, – dedi, – Allahı görə bildinmi?

– Gördüm, Allah sənin dərdini bilirmiş, dərmanını da dedi. Dedi ki, dibində yatır-xəzinə var, çıxartdır, sağalacaqsan.

Ağac elə sevindi, az qaldı kökündən çıxsın:

– Sən özün çıxart, xəzinə də sənin olsun.

– Yox, – dedi, Adam, – sənin dibini qazmaq ağır işdi. Allah mənim öz qismətimi verib, gedib öz qismətimi tapacam, – dedi də getdi.

Ağac Adamın ardınca baxa-baxa qaldı...

Bozqurd Adamı gözləyirdi:

– Gəldinmi, – dedi, – Allahı gördünmü?!

– Gördüm, bir axmaq adamın beyni onun dərmanıdı, dedi Allah, – yesə sağalacaq. Get bir axmaq adam tap, beyinini ye.

Qurd soruşdu:

– Ağaca nə dedi?

– Ağacın, – dedi, – dibində xəzinə var, xəzinəni çıxartsalar sağalacaq.

– Çıxartdınmı?

– Yox, – dedi Adam.

– Niyə? – soruşdu Qurd.

– Allah mənim öz qismətimi verib, gedirəm onu tapmağa.

Bozqurd gördü bunnan axmağını tapa bilməyəcək, Allahın göndərdiyi dərman elə budu... Adam aralanmışdı, dörd yanına baxa-baxa gedirdi ki, görsün Allah qismətini hara qoyub. Amma Bozqurd artıq ona çatmışdı...

***

Məsəl var, deyərlər: "Qurd anıldığı yerə gələr". Ona görə də *tərəkəmə qurdun* adını çəkməz, həmişə "ağzıyanmış" deyər. Qurdun bir adı da *börüdü*, "*məşədi börü"*... Uşaq vaxtı "kor duman" gələndə dumana üz tutub oxuyardıq:

*Börü-börü, meşədə börü,*
*İt gördü üşüdü börü,*
*At gördü üşüdü börü.*
*Yemək-içmək dalınca*
*Düz bizim kəndə gəldi,*
*Oldu, Məşədi börü...*

“Qurd üzü mübarəkdi”, deyərlər. Yazı boyunca yeri gəldikcə “bu mübarək üz” anılacaq, qurdla bağlı xalqın bildiklərini, baxışlarını-görüşlərini qeyd edəcəyik. İndi isə...

**Üzlü qonaq...**

Belə deyirlər ki, günün birində bir evə qonaq gəlir. Allah qonağıdı, bu gün gəlib sabah da gedər, deyib içəri alırlar, yeməyini-içməyini veririlər, hörmətlərini eləyirlər. Səhər açılır, sabah olur, qonaq gedənə oxşamır. Yenə qulluğunu eləyirlər, eybi yox, bu gün getmədi, sabah gedər, deyib yeməyini-içməyini verirlər. Bir belə, beş belə, görürlər yox, qonaq yaman ağır oturub, tərpənmək fikrində deyil. Ev yiyəsi anlaqlı adam idi, baxdı, qonaq evin yuxarı başında, – **dör,** deyilən yerdə “yeddi mərtəbədən” əyləşib yeyib-içib indi də evin pişiyiylə məzələnir, pişiyə də nə var, qılıq kimin üzündədi, yiyəsi odu, deyərlər. Ev yiyəsi yenə şeytana lənət deyir, qonaqla bağlı nə qədər məsəllər, atalar sözü bilirsə fikrindən keçirir: “Qonaq ruzudu”, “ Qonaq özüylə ruzusunu da gətirər”, “Qonaq qonağı istəməz, ev yiyəsi də heş birini”, “Qonaqsız ev suyu soğulmuş dəyirmandı”. Nə isə, ev yiyəsi bir gün yenə səbir edir. Bir gündən sonra görür qonaq mütəkkəyə dirsəklənib uzanıb taxtın üstünə burdan-ora, çay istəyir. Ev yiyəsi işi belə görüb pişiyi qucağına götürür, qonağa baxa-baxa oxuyur:

*Pişiyim, pişik ovuna,*
*Siçan düşər ovuna.*
*Qonaq bu gün burdadı,*
*Sabah gedər evinə.*

Qonaq da himə bənd imiş, mütəkkədən azacıq dikəlib pişiyi çağırır: – piş-pişş. Pişik də elə gəldiyi gündən qonağa işləyirdi. Dırmaşıb girdi qonağın qucağına. Qonaq pişiyi tumarlaya-tumarlaya oxudu:

*Pişiyim pişik izlə, ha,*
*Siçan tutdun gizlə, ha.*
*Qonaq bu il burdadı,*
*Gələn ili gözlə, ha...*

***

*Dədələr deyər, yer üzündə bircə qarış yerin də “əyəsi” var, yəni yiyəsi. Buna da bizdən “yeylər”deyirik, yəni bizdən yaxşılar. İndinin özündə də aramızda belə bir inam yaşayır: “Yurdu biz tərk etsək də,*

*bizdən yeylər, yəni yaxşı ruhlar yurdu tərk etməz". Ona görə də kimsəsiz yurdlara, – evlərə gedəndə salam ver: – Salam, ey bu yurdun* ***əyəsi.*** *İnancımıza görə qapının ağzına qaynar su tökməzlər, çünki gördüklərin qədər də görmədiklərin var.*

*Axşamüstü qapı süpürülməz, çünki o vaxt astanalara hər ailənin öz ruzusu bərəkəti gəlir, deyərlər, qapılar bu vaxtlar bərəkət ətəyinə dönür. Bərəkəti süpürmə, deyərlər.*

*Qırt yatan anaş toyuğun üstünə güllə gəlməzlər...*

*Gülü solduranda yerə atma, suya at ki, ömründən olmasın.*

*Deyərlər, hər yetənə sirrini açma, özün üstü açıq qalarsan...*

## Çoban Məmməddən gözəlləmə...

Aşıq Ələsgərin qardaşı çoban Məmmədin də sinədən söz deməyi vardı. Kasıb idi, bir bölük də oğul-uşağı vardı, bir qarına ac, bir qarına tox yaşayırdılar. Arvad bir gün ərinə deyir: – Dananı sat, əynimə paltar al, kənd bir yana, artıq öz uşaqlarımdan da utanıram.

Çoban Məmmədin çarəsi qalmır, görür arvad düz deyir, dananı yedəkləyib aparır bazara. Düşərinə-düşməzinə yenicə satıbmış ki, borclular tökülüşür üstünə, əlindəkinin hamısını alırlar. Məmməd də neynəsin, suyu süzülə-süzülə qayıdır evə. Arvad elə dana gedəndən qapıda gözləyirdi, gördü, əri gəlir, özü də əli ətəyindən uzun gəlir, istədi daşı-kəsəyi başına yağdırsın, amma düşündü ki, bunun da xeyri yoxdu. Deyərlər "gəlin ocağa çəkər, kömbə bucağa", arvad da sinədən deyənmiş. Saz divardan asılıydı, götürüb görək nə dedi, necə dedi:

*Dedim paltar gəti, yaşıldan-aldan,*
*Əbrüdən-atlasdan, tirmədən, şaldan,*
*Alışdım-yandımnan, bahalı maldan,*
*Gün verməræm, günü qara düşərsən.*

Çoban Məmməd bazardan çıxandan qorxu içindəydi, elə bilirdi ki, arvad ağac götürəcək, saz yox. Qılığa keçdi:

*Paltar allam, qızıl düymə taxılar,*
*Onu görən nəfsin salar, yıxılar.*
*Ocağım qaralar, evim yıxılar,*
*Nə bilirsən bəxtəfərə düşərsən.*

Arvad səsini daha da qaldırdı, fikrində dedi, ağzım açılmışkən ürəyimi boşaldım:

*Mənnən gözəl kimdi qızda-gəlində,*
*Ağkilsə kəndində, Göyçə elində,*
*Gedərəm qalarsan yetim əlində*
*Ah çəkibən ahu-zara düşərsən.*

Məmməd gördü, "xına o xınadan deyil", qılığı keçməyəcək, üzünü bozartdı:

*Axmaq oldum, niyə düşdüm felinə,*
*Dana getdi, əlin qoydun belinə.*
*İndi budu çatammıram dilinə*
*Üz çevirrəm, qapılara düşərsən.*

Söz arvada əsər elədi, bir az özünə gələn kimi oldu:

*Demədim ki, yüz ver, yüzdən al gəti,*
*Elə belə, ağdan-bezdən al gəti,*
*Gücün çatan çoxdan-azdan al gəti,*
*Vaxtı gələr bahalara düşərsən.*

Çoban Məmməd gördü arvad yumşalır, o da yumşaldı:

*Çoban Məmməd de neynəsin yoxunan,*
*Əyir yunnan özünə don toxuynan.*
*Bacarmazsan lap o qədər çoxunan,*
*Bezikərsən min bazara düşərsən...*

Söz tamama yetişdi...

***

Elə bu cür saza-sözə görə də el arasında deyim var: Aclıq olsun, kef olsun", "Kasıbam, dediyinə baxma, gündə toy-düyündədi"... Ona görə də deyərlər: "kasıbın əkdiyi bitməz, .... bitər".

Məsəl var: "Cavan oğlan cavan qızdan həyalı gərək".

Deyərlər, suyu durultmaq üçün ağac salmısansa, bu, suyu bulandırmaqdı, çünki "dəyənəklə su durulmaz".

Deyərlər: "Əl comərddi, göz namərd"...

## Qız anasının bəd öyüdü...

*Bir arvad qızını gəlin köçürürdü. Yengəli, sağdışlı, soldışlı, təmtaraqla yola salırdı. Nə demişdi, nə deməmişdi, qapıdan çıxanda son öyüdünü deyirdi: "Qızım, anadan olannan üzün ər evinədi. Bunu Dədələr deyib, "qız üzü ər evinə doğular". Gedirsən, bu gündən ər evində olacaqsan, yadında saxla, qarşına üç arx çıxacaq, əgər bu arxları bir deyəndə atdana bildin, ər sənindi, mindin boynuna, yox, atdana bilmədin, onda özünnən küs. Qız dedi: – Can ana, açıq de, bir şey anlaya bilmədim...*

*Anası dedi: – Qızım, birinci arx odu ki, ərin sənnən su istəyəcək. Onda de: – Odu səhəng, get iç, birin də mənə gətir. İkinci arx odu ki, deyəcək, paltarımı ver, geyinim. Deyərsən, paltarını da mənmi geyindirim. Onunçünmü gəlmişəm, de, qaş-qabağını salla, dinib danışma. Üçüncüdə deyəcək: – Çaydan-çörəkdən gətir, yeyək. Yeməyə bir şey olsa da, deynən, nə gətirmisən, nə də olsun.*

*Beləcə, hay-harayla qızını köçürdü, ər evinə. Səhər açıldı, bəyin də necə deyərlər, təzə çağı; ağır otur, yüngül dur. Dedi: – Paltarımı ver geyinim. Gəlin ürəyində dedi: – Aha, birinci arxa çatdım. Qayıdıb, – paltarını da mənmi geyindirəcəm, – dedi – get, geyin. Əri qalxdı, sakitcə paltarını geyinib getdi işinin ardınca. Günorta gəldi: – Su ver, içim, – dedi. Gəlin dedi: – Odu, səhəng, get nə qədər istəyirsən iç. Yenə əri heç nə demədi, qalxıb su götürüb içdi. Axşam düşdü, əri gəldi: – Nəyin var, çaydan-çörəkdən, – dedi, – gətir yeyək... Gəlin də üçüncü arxı gözləyirdi: – Nə gətirmisən, nə də olsun, – dedi. – Get, bir şey tap, ye...! Əri qalxıb onu döydü, qolunun birini qırıb yanına saldı.*

*Xəbər çatdı anasına, başı alovlu özünü yetirdi. İstədi, çığır-bağır salsın, qöz qoymadı: – dinmə, – dedi, – mənim qolumu sən qırdın, sənin sözünə baxdım, birinci arxı atdandım, ikincini atdandım, üçüncünü atdananda qolum sındı...*

***

Bütün zamanların *gerçəyi* budur ki, **Xalq** min il qabaq olduğu kimi, həmişə də öz sözünü deyir, yaratdıqlarını yaradır və yaratmaqdadır. Heç nəyi nəzərindən yayındırıb gözündən qoymaz, o an da münasibətini bildirər, desə də, deməsə də, hər şeyi, olanları da, olacaqları da qiymətləndirər. Bütün bunlar *xalqın milli səmtindən, özünü dərk edib anladığı yöndən gəlir. Yəni bu münasibət xalqın millət olmağından bəhrələnir. Heç nədən asılı deyil; nə siyasətdən, nə dindən...*

## Elin həndi...

Bir kənddə bir molla yaşayırmış, amma bu molla gündüz mollalıq, gecə oğurluq eləyirmiş. Payız ayı, bar-bəhər vaxtıymış. Molla gecənin bir yarısında ya Allah, deyib zəmiyə taxıl oğurluğuna gedir. Çatan kimi yavaşcadan deyir:

– Salam əleyküm, eey elin həndi...! – Zəminin yerinə də özü cavab verir:

– Ay əleykümə salam, Molleyi Rəcəb əfəndi.

Qayıdıb deyir:

– Nə deyirsən, çin götürüb qırpınmağa gəlmişəm.

Çırpınımmı, qırpınımmı?!

Yenə zəminin yerinə özü cavab verir:

– Xoş gəlib səfalara gəlmisən,

Çırpınna da, qırpınna da...

Molla beləcə, torbasını doldurur, evinə qayıdır. Deyərlər, *tamarzıdan al, dadanmışa ver.* Bununla bağlı belə məsəl də var: *dadanan dadda qalar, bir gün gələr yadda qalar.* Molla dadanmışdı, bir getdi, iki getdi, axırda zəmi yiyəsinin dalağı sancdı, bildi ki, taxıla dadanan var. Yeddi qotazlı qamçısı vardı, açılanda elə bil tüfəng açılırdı. Bunu da götürüb getdi, zəminin içində gizləndi...

Molla yola elə öyrəşmişdi ki, artıq qımqını çala-çala gedirdi. Zəmiyə çatıb həmişəki kimi dedi:

– Səlamün əleykümə, eyy elin həndi.

Yenə özü cavab verdi:

– Ay əleyküm-əssəlam, molleyi-Rəcəb əfəndi.

Zəmi yiyəsi kirimişcə qulaq asır, yeddi mərtəbəli qamçısını hazırlayırdı, Molla yenə dedi:

– Çin götürüb qırpınmağa gəlmişəm, izin ver, qırpım səni!

Sözün bu yerində zəmi yiyəsi gizləndiyi yerdən çıxıb dedi:

– Həə, Molleyi-Rəcəb əfəndi, sən bura çırpılmağa gəlmisən.

İzin ver, çırpım səni! – Belə deyib doğrudan da Mollanı çırpmağa başladı...

## Toy-düyün tapmacası...

Deyir günlərin birində gəlini atdandırdılar, toy-düyün karvanı yola düşdü, kənddən çıxa-çıxdaydı, kəndin ağsaqqalı durdu ayağa ki, toyun qarşısını kəsəcəm, bağlama deyərəm, açmasını bilərlər, yol onlarındı,

yox, bilməzlər, yol mənimdi. Elə də elədi. Toyun qarşısına çıxıb əl qaldırdı. Toy igidləri gülüb dedilər:

– Baba deyəsən güləşmək istəyir.

Ağsaqqal dedi:

– Bir bağlama deyəcəm, cavabını tapsanız yol sizindi, tapmasanız mənim. Nə vaxt istəsəm o vaxt da yol verərəm.

Dedilər:

– Buyurun...

Ağsaqqal dedi:

– O nədi ki,
Ataya dəyməz,
Babaya dəyər,
Xalaya dəyməz,
Əmiyə dəyər.
Dəyərə dəyməz,
Dəyməzə dəyər.

Toy-düyün adamları qaldılar baxa-baxa... Cavabı tapa bilmədilər. Gəlin hər şeyi duvaq altından görürdü, duvağı üzündən çəkib dedi:

Baba o dodaqdı...
Dəyərə dəyməz,
Dəyməzə dəyər...

Ağsaqqal baş endərib:

– Düzdü, – dedi, – qızım, halal olsun səni doğan anaya, buyurun, uğurlar olsun, yol sizindi...

***

**Bığ yağı...**

*Belə deyirlər ki, bir ər, bir arvad varmış, bunların da xeyrə-şərə yaramaz bir oğulları. Birtəhər yaşayırmışlar. Amma kişi özünə baxanmış, üzünə-gözünə, taxımına fikir verənmiş. El diliylə desək, şenliyə – kəndin içinə çıxanda həmişə bığını yağlayarmış. Günlərin birində görür ki, küpədə yağ qurtarha-qurtardı, yağdan bir qaşıq götürüb qoyur bir yana ki, kəndə-kəsəyə çıxanda bığını yağlasın. Nə isə, bığını yağlayıb yenə çıxmışdı şenliyə, adam arasına. Görən də deyirmiş ki, kişi ya quymaq yeyib, ya da plov...*

*Günlərin birində kişinin oğlu bərk acıbmış, evdə də heç nə yox. Ora baxır, bura baxır, əlinə bir şey keçmir, götürüb kişinin bığ yağını yeyir, çıxır bayıra. Görür ki, dədəsi camaatın arasındadı, bığı da par-par parıldayır. Qaça- qaça gəlir ki, bəs, ay dədə, pişik bığ yağını yedi.*

*"Bığ yağı"ifadəsi belə yaranıb...*

***

Türklərin *su, işıq, külək (hava)* kimi azad, sərbəst dövrləriydi, torpağın harası yumşaqdı ora axırdılar, rüzgarlara qatılıb keçib gedirdilər, işıq tək getdiyi yerləri aydınlada-aydınlada öz milli mədəniyyətini-kültürünü yayıb yaşayıb, yaşatdığı zamanlar idi...

Yer üzündə çox geniş anlamda yer-yurd adlarının türk mənşəli olduğu faktı da ona görə danılmazdır... Bu cür danılmaz faktlarsa onun yaddaşının yaşamasıdı. Daha doğrusu, yaddaşlarda yaşamağıdı... İşıq göstərdikləriylə göründüyü kimi, *TÜRK də yaddaşıyla görünür. Özü fikrini yaratdığı hekayətlərlə belə bildirir...*

## Dodaqqaçdılar...

*Biri varmış, biri yoxmuş, bir dəvəymiş, bir qurdmuş, bir də tülkü. Dünyanın harasıymışsa, yol gəlirlərmiş. Bir* ***kökyə*** *(kömbə çörəyi) rast gəlirlər. Dəvə deyir: – Kökəni bölməliyik. Tülkü deyir: – Bölməyək, bölsək nə düşəcək bizə. Hərə öz yaşını desin, kimin yaşı çox olarsa, kökə də onun olsun...*

*Deyirlər, yaxşı. Qurd önə çıxır, deyir: – Anamın birçəyi haqqı, dünya binə olanda mən vardım.*

*Tülkü tez onun sözünü kəsir: – Nə danışırsan sən, arsız-arsız hələ bir and da içirsən, dünya binə olanda mən vardım, bir də bir oğlum vardı, adını da Binəli qoymuşdum. Sən vardınsa , bə niyə görmədim səni?!.*

*Sıra çatır dəvəyə. Dəvə işi belə görüb əyilib kökəni götürür, atır ağzına, gövşəyə-gövşəyə deyir: – Hə, onda dəvə uşaq olarmış...*

***

Amma bir şey var ki, tarixlərin bütün dönəmində niyəsə, hansı istila nə göstərdisə, nəyini göstərdisə, istədik, istəmədik, mənimsəməyə çalışdıq. Amma heç nə bizim olmadı, arada da bizim olmayan yad şeylər qaldı, özümüzün olanlar unuduldu... Böyük Hun imperatorluğunu, Göytürk imperatorluğunu Kiçik Midiyanın – Qızılbaş Midiyasının adını düşünmədən dəyişib babamızın adına Səlcuq, Osmanlı, Səfəvi dövləti qoyanda buna da şükür deməkdən başqa çarə qalmır.

## Tərəkəmə öynəsi, sınanclar...

*Ağsaqqallar deyər: uca boylu, nazik buynuzlu, göyümsov, yekəqarın, sağ yanından ön qabırğası aralı olan inəklər süddü olar; amma südü*

*yağlı-yararlı olmaz. Qara rəngli, gödək buynuzlu, tökmə, yəni ağır sığırın südü az, amma yağlı-yararlı olar. Belə inəklər, dədələr sözü, qışa da dözümlüdü. Elə inək var ki, boynu gödək, həm də yoğundu. Başı da yasdıdı. Belə inəklər süd verməz, yeməyini bol eləsən də xeyri yoxdu. Adına öküz inək deyərlər, daha çox ətliyə saxlayarlar. Belə deyirlər ki, ağ inəklərin südü cır olar, yəni bir az turş. Nə istiyə dözümləri olar, nə soyuğa. Çox yaxşı bala bəsləyirlər. Belə inəklərə* **yuxa mal** *deyirlər... Qara, ala mallar südlü olur, həm də qılığa gedəndilər, eydirmə de, qılıqla. Nəyi var versin sənə. Amma çox yeyicidi, kəndin diliylə desək, boğazlı olurlar. Ona görə də ot az olan yerlərdə belə inək saxlamırlar. Məsəl var: Deyərlər, qızıl inək qaraqabaq gəlinə südün verməz.*

**Bayatılar...**

*Bağça bara bağlıdı,*
*Heyva nara bağlıdı.*
*Viran qalmış mahnının*
*Hamsı yara bağlıdı.*

*Damları dam üstədi,*
*Qırğısı qol üstədi.*
*Suya hardan gedim mən,*
*Nişanlım yol üstədi.*

*Düşən ağlar,*
*Yıxılıb düşən ağlar.*
*Qoy düşsün yad gözünə,*
*Zülfünə düşən ağlar...*

***

Mən əslinə qalsa bu fikirləri bildirmək istəyirəm; yazının əvvəlində də dedim, biz *tarixi səliqəylə, yəni yalnız tarix kimi yox, təbiət hadisəsi kimi yaratdıq,* amma tarixi yaratdığımız kimi yazmaqda, yaşatmaqda səliqəli olmadıq... Yazsaq da, əlimizdə saxlamağı bacarmadıq, unutduq, itirdik. İndi özümə məxsus bir ifadəylə bu fikri belə təqdim edərdim: *əsl tarix yazılmaq üçün yaradılmasa da, tarixi yazmaq lazımmış*; bir həqiqət var ki, *bizim əsl tariximiz özümüzün xəbərimiz olmadan xalqımızın yaddaşına, içinə yazıldı. Xalqın iç dünyasına, yaddaşına yazılanlar; məsəllərimiz, atalar sözləri, nağıllarımız, dastanlarımız yaşayışımızda,* məişətimizdə, *həyat tərzimizdə bizi indinin özündə də dahiyanə üstünlüklərlə*

*idarə edən və idarə etməkdə olan adət-ənənələrimiz elə bizim TARİXİMİZdir.*

“Qorqud Atanın kitabı” dastanı haqda belə bir fikrim – qənaətim var. Qorqudşünas alimlərimizdən üzr istəyərək, bir yazıçı kimi hisslərimi, duyduqlarımı bidirim: Mənə belə gəlir ki, “Koroğlu”, “Əsli Kərəm”, “Aşıq Qərib” və sair dastanlarımız kimi, “Kitabi-Dədə Qorqud” dastanı yaddaşın, şifahi ədəbiyyatın məhsulu deyil. “Dədə Qorqud dastanı” daşıdığı fikrə, düşüncəyə, əsasən bu düşüncənin ifadəsinə, özü də yüksək səviyyədə obrazlı ifadəsinə görə yazılı abidə, islam dininə qədər mövcud olmuş hansısa bir yazılı qaynaqdan köçürülmüş olduğu iddiasındayam. Əlbəttə, bu, mənim öz subyektiv fikrimdir. Dastanın özünün yazılış dili, dilin ifadə gücü, bir cümlə ilə anlaşılan və açılan geniş mənzərə, əsərin əhatə tutumu bu fikri müdafiə etməyə imkan verir.

**Milli oyunlarımızdan – Beş daş...**

Bu oyunu oynamaqçün beş dənə daş götürülür...Vacib deyil ki, mütləq daş olsun... İndiki şəraitdə müxtəlif meteriallardan da ola bilər. amma yumru, dənəvər daşlar seçilməlidi ki, əl üstündə saxlamaq o qədər də asan olmasın, çünki, hər oyunun sonunda xal yığmaq üçün daşları göyə atıb əl üstündə saxlamaq lazım gəlir. Daşın hamısını əlinin üstündə saxlamağı bacaran ən yüksək bal yığır. Bunu tək əlli də etmək olar, cüt əlli də. Bununçün öncədən danışmaq lazımdı. Əlbəttə, tək əllə oynamaq, bir əlin üstündə çox daş saxlamaq təbii ki, çətindir, elə bu çətinlik də oyunun dramatik, kəskin keçməsi üçündür...

Bu oyunu beş adam da oynaya bilər, iki adam da... Daha çox qız oyunu kimi tanınır.

1-ci gediş... Beş dənə daşı bir əldə tutursan... Birini göyə atıb dördünü yerə qoymalısan; yerə qoyduğun daşlar göydəki daş yerə düşənəcən yerini tapmalıdı... Bir şeyi də bilməlisən ki, ikinci gedişdə yerdəki daşları göydəki daş ovcuna düşənəcən götürməlisən... Ona görə də birinci gedişdə daşları elə qoymalısan ikinci gedişdə yerdən götürmək sənə asan olsun.

2-ci gediş, dənnəmə... Göydəki daşı tutub təzədən göyə atırsan, yerdəkiləri bir-bir götürənəcən təkrar edirsən... Buna “dənnəmə” deyilir.

3-cü gediş, ikiləmə... Daşın birini göyə atıb dördünü yerə qoyursan, sonra həmin qaydada, yəni göydəki daşı tutanacan yerdəkiləri iki-iki götürməlisən. Ona görə də əvvəlcədən elə eləməlisən ki, daşlar bir-birindən aralı və yaxud səmtsiz düşməsin ki, yerdən götürmək asan olsun.

4-cü gediş, üçləmə... Üçü bir, biri tək... həmin qaydada, tək daşı göyə atıb tutanacan yerdəkiləri üçünü bir, birini bir ayırıb götürməlisən...

5-cü gediş. Gözətçi adlanır... Öz çərəyinlə qapı düzəldirsən, bu qapının ağzına gözətçi qoyursan. Gözətçinin adı olmalıdı. Şirvan-Ərəş mahalında gözətçinin adı adətən İgid olur. Yurdumuzun batı-qərb bölgəsində gözətçi adətən Molla adlanır... Bəzi yerlərdə Çərək qapısına gözətçi kimi it bağlanır. Nə isə... Çərəyinlə qapı qurmalısan, göy daşını atıb tutanacan yerdəki daşları bir-bir bu qapıdan içəri ötürməlisən, elə eləməlisən ki, içəri ötürülən daşlar qapıdakı gözətçi daşa toxunmasın...

Gediş edən oyunçu çərəyiylə qapı düzəldib rəqibini gizləyir.

Rəqib oyunçu içəri ötürüləcək daşları izləmək üçün dediyimiz kimi, çərək qapının ağzına gözətçi qoyub adlandırmalıdı... Bunun üçün gediş edən oyunçu rəqibinə deyir:

– Özünə gözətçi seç!

Rəqib:

– Mən qapıya it bağlayıram, gözətçim itdi.

Oyunçu:

– Olmaz! İt qapar məni...

Rəqib:

– Yaxşı, qurd bağlayıram...

Oyunçu:

– Qorxuram, qurd yeyər məni...

Rəqib:

– Yaxşı, qoy gözətçim İgid olsun...

Oyunçu:

– Yox-yox, igid sevər məni...

Rəqib:

– Yaxşı, onda qapını Mollaya tapşıraq...

Beləliklə, Molla gözətçi olur... Dediyimiz kimi, gediş edən elə etməlidi ki, daşlar çərək qapıdan keçəndə Mollaya (Molla adlanan daşa) toxunmadan keçsin.

Sonra, oyunun sonunda daşların hamısını atıb əl üstündə saxlamalısan. Kim əlinin üstündə çox daş saxlasa xalı da çox olur...

Beləliklə, həmin adam qalib olur, oyunu udur...

## İnanclarımız...

*Quzey otu qaraya çalar, güney otu qırmızıya.*
*Sürülər dağ güneyində tərpənməz, iynə olub bir qarış otluğa sancılar.*
*Tumov (qrip) oldun, reyhan çiçəyini iylə.*
*Əncirlə qursaq-mədə ağrısını sağaltmaq olar.*
*Quru qoz qabığını əz, külfəcdən keçir, qan axmanı dayandırar.*

*Deyərlər, bir uşağa on beş yaşınacan sarımsaq yedirtsən gündüz göydə ulduzları görə bilər.*

*Qaraçərək otu ölümnən başqa bütün ağrıların dərmanıdı..*

***

Mənim amacım bildiyim, anladığım qədərində yazılı tarixdən, kitab tarixindən yox, bu, dediyim, içimizdə, iç dünyamızda möhtəşəm abidələrə dönmüş tarixi yaradıcılıq haqda yazmaqdır...

"Yağışda at, küləkli, yelli havada qoyun, toyda qız bəyənən, səhv edər". Bu atalar sözünün daşıdığı mənaların üzərində dayanaq...

Yağışlı havada yer sürüşkən olur, ona görə də atın yerişini doğru-düzgün bilmək mümkün deyil. Yelli havada qoyun seçmək çətindi, külək əsir, qoyunu başqa görkəmə salır, yel yunun arasına dolub qoyunu kök göstərir, olduğu kimi görünməyinə mane olur; səhv etməyə məhkumsan. Qaldı sonuncu anlayış... toyda qız bəyənmək. Heç bir qız, heç bir toyda təbii halında deyil, ola da bilməz. Bəzək-düzəklər, işvələr, cilvələr onu gizlətməlidi. Ona görə də dədə-babadan toyda gördükləri qızı toysuz, toydan sonraların sınaqları gözləyir...

*Birinci sınaq,* bulaq başına oğlan evindən adam göndərilir; qızı suya gedəndə yox, sudan qayıdanda danışığa-söhbətə tutur, əgər qız çiynində səhəng yük altında dayanıb söhbətə qatılırsa bu kifayət eləyir ki, ondan üz döndərilsin... Ən azı ona görə ki, çiynində sənək dayanıb qeybətə qoşulan qızdan gəlin olmaz.

*İkinci sınaq,* qız keçdiyi yola əşyalar atılır, əgər qız onların üstündən heç nə yoxmuş kimi keçib gedəcəksə, üz döndərilir. Misal üçün gəlin süpürgəni evin baş tərəfində görüb götürüb yerinə qoymursa, bu, onun anlaqsız, səliqəsiz, pinti olmağnı göstərmirmi...?!

Əlbəttə, deyəcəklər ki, indi səhəng əsri deyil, süpürgə vaxtı deyil, bu cür qız bəynmək artıq gülüncdü. Mən sayqılı, sayın oxucumdan təmkinli olmağı xahiş edirəm. Söhbət heç də səhəngdən getmir. Söhbət heç də toyda qız bəyənməkdən və s... getmir. Söhbət **ana** qızdan gedir, yəni ana olmağı bacara bilən qızdan gedir... Mənim xahişimi nəzərə alıb tələsməsək, bu gün bütün dünyanın anasızlıqla üz-üzə qalmaq qorxusunun gerçək olduğunu anlayarıq...

İndi mən bu hissləri ifadə etdikcə, 1980-ci illərin əvvəllərində yazdığım bir şeiri xatırlayıram...

*Yoxsan bu rənglər altda, qız,*
*üzün-gözün hanı?!*
*İtirmisən vaxtı-vədəni,*

*gecən-gündüzün hanı?!*
*Hanı o gülüşlərin ki,*
*əksimi görərdim üstündə, şüşə kimiydi?!*
*Nədən döngələrdə qırılır sevgin,*
*bir vaxt ki, başa kimiydi?!*

*Sən ki, sevimli bir varlıqdın,*
*özünü qorumursan, niyə?*
*Niyə bitib-tükənib ətrin,*
*çiçək tək qoxumursan, niyə?!*
*Anasız qalacayıq, qız, inan,*
*Dərdlərin ən ağırıdı, bu!*
*Bütün ölümlər-itimlər yalan,*
*Dünyanın axırıdı, bu!*

***

**Gözaltı...**

**Bir qarı** nəvəsini evləndirmək istəyirdi. Günlərin birində nəvəsi dedi: – Nənə, qonşunun qızını gözaltı eləmişəm, get, gör, sən də bəyənərsənmi, ağızlarını ara, gör nə deyirlər?!

Qarı: – hə, – dedi, – gedim, dindirim söylədim, görüm, kimdi sevib seçdiyin?

Qarının öz diliylə desək, "dəlikli muncuq yerdə qalmaz", ətəyini dəstələyib üz tutdu qız evinə. Yenə qarının diliylə desək, qız evi də nolacaq, "on qonağı gəlsə, onunu da elçi biləcək"... pah, qarını bir mərtəbəylə qarşıladılar ki, tərifini gərək sazla deyəsən. Qulaqlarına söz çatmışdı, axı. Qarı hal-əhvaldan sonra qızı çağırtdırdı yanına.

– Qızım, mən səni alıb aparsam, qışda nəyim olarsan, yayda nəyim, payızda nəyim?.

Qız dedi: – Nənə, məni alıb aparsan, qışda ocağın olaram, yayda sazağın, payızda bucağın.

Qarı dedi: – Qızım, atan evi sənin nəyindi?

Qız dedi: – Ər evinnən baxıb deyərəm, görüm ordan necə görünür.

Qarı dedi: – Yaxşı, ağıllı qızım, harda olur, sənin süpürgən?

Qız dedi: – Səhər erkən əlimdə, günorta eşikdə, axşam ayaqda...

Qarı dedi: – Qızım, halal olsun ananın südü.

Yıxıla-qalxa özünü saldı evə, nəvəsinin üz-gözündən öpüb dedi:

– Yaxşı qız seçmisən, halalın olsun, qoşa qarıyasan, yığvalı yeyinnən, ocağın eyinnən olun...

***

Yaranışın – dünyanın yəni, qanunları dəyişilməzdir, bu qanunların yaxşı ki, yaranması da, icrası da səndən, məndən – bizdən asılı deyil... Bu qanunlar həm də **Vaxt** deməkdir; gəlir, səhvləri, yanlışlıqları düzəltməkdən daha çox göstərmək üçün, **görk üçün** gəlir, heç nəyi heç kəsə bağışlamır; yalanları itirir, yaşanası olanları yaşadır...

## Gənəçi...

Tərəkəmələrdə, yaylaq-qışlaq həyatı yaşayan türk tayfalarında GƏNƏÇİ deyilən bir termin var, əsasən maldarlıqla-qoyunçuluqla məşğul olduğu üçün ona həmişə Gənəçi, yəni baytar həkim lazım idi. Ona görə ki, GƏNƏ xəstəliyi, mala-qoyuna gənənin yayılmağı indi olduğu kimi, bütün zamanlarda vardı; yaşayışa ən çox ziyan vuran xəstəliklərdən biridi...

GƏNƏÇİ-həkim hazırlamaq, yetişdirmək, təlim vermək də çox çətin olduğu üçün gənəçilər tapılmırdı. Eldə-obada adıyla sayılan bir-iki GƏNƏÇİ olardı, ya olmazdı. Olanda da o eldən bu elə var-dövlət bağışlamaqla, təntənəylə dəvət olunardı, çünki gənəçinin təlim görüb yaranması da Şamanlar tərəfindən ruhun çağırılması, ruhun qovulması kimi birbaşa təbiət hadisəsiydi, daha doğrusu, təbiət hadisəsi olmalıydı; anadangəlmə... Elə etmək lazım idi ki, uşaq, fərqi yoxdu, oğlan ya qız hələ ana bətninə düşən anından təlim mərasiminə başlasın, ona görə ki, bu mərasim dəqiq hesablamalara bağlıdı ki, bunu ancaq el arasında vergi – görücülük verilmiş kimi tanınan bir-iki qoca qarı bacarardı...

Bu haqda mən 1960-cı illərin sonu 70-ci illərin önlərində "Bulaq" radio verilişinə gələn məktubların birində oxumuşdum. Bu məktubun ardınca getdim, kənd-kənd, oba-oba öyrəndim, araşdırdım, tədqiqat apardım, bildiklərimi bir neçə radio verilişində səsləndirdim, 1979-cu ildəsə "Köç" romanında da xırdalıqlarınacan işlədim.

Bu mərasim dediyim kimi, birbaşa təbiət hadisəsinə – yazın gəlməyinə, varlığın dəyişməyinə bənzədiyi üçün gerçək hesablamalara çox bağlıdı...

Bu təlim-mərasim necə başlayır?

İlk öncə Şaman qarının üstünə minnətə gedilir, elin-obanın seçilmiş adamları (şahın, bəyin, xanın adamları da ola bilir) pay-ürüşlə QARININ qapısına gedib razılığını alırlar... sonra QARININ iştirakıyla təzə toyluların arasından cütlük seçilir. Ən çətin və əsas işlərdən biri bu seçimdi, QARI gərək seçimində yanılmasın. Ona görə də qarı cütlüyün

yeddi arxa dönənindən, nəslindən-nəcabətindən başlayır; südünə, sümüyünə, qanınacan öyrənir.

Gəlin Qarının göstərişiylə uşağa qalmalıdı, Qarının göstərişiylə oturub durmalı, Qarının göstərişiylə yeyib içməlidi, boyundakı uşağın ilk anından səs eşitdirməlidi, laylalarla öz səsini duyurmalıdı...

Uşağın doğulmağına yeddi gün qalmış Qarı yeddi arxacdan yeddi gənə yığır, bir qarış uzunluğunda qarğını buğumundan kəsir, gənələri qarğıya ötürür, ağzını mumla qapayır, əlçatmaz bir yerə qoyur, (məktubda yazılmışdı, kərənin gəzinə). Uşaq anadan olanacan, içində yeddi gənə olan qarğı-qamış Qarının nəzarətində qalır. Qarı hər gün qamışı nəm olsun deyə suya batırıb yerinə qoyur. Gənələrsə gündə yığışıb hansı zəifdisə, onu yeyirlər, hər gün biri azalır. Beləliklə, axıra ən güclüsü qalır. Yeddi gündən sonra, yəni uşaq anadan olan kimi, Qarı qamışın müşəmbəsini açır, bir dənə gənə qalıb, yan-yörəsini yeyib dırnaq boyda olub. İşığa çıxan kimi partlayacaq, Qarı bilir bunu, ona görə də gənəni üksükdə çıxardır... Gəlinin ağız südünü, alır, ona qarışdırır, – ağız bulaması da deyilir (məktubda ağız bulaması yazılmışdı). Uşağı onunla mayalayır, qırxı çıxanacan uşağı qovrulmuş gənə yağıyla yağlayır... Sonra uşağı hələ qundaqda ikən oymaq-oymaq gəzdirirlər, uşağın getdiyi yerdə gənə qalmır, mal-qaradan, qoyun-quzudan, yataqdan, arxacdan gənələr tökülüb qırılırlar...

***

Mən uşaq ikən Gürcüstana bağlı Dağ Borçalının Yırğançaq kəndindən bizim kəndə gənəçi gəlmişdi... Niyəsə bu gəlişin vahiməsini indi də xatırlayıram.

Yeri gəlmişkən bu kəndin adıyla bağlı fikrimi bildirim. Məncə İrqancay, Yırğançay, Yırğançaq kimi səslənən bu kəndin adı Ürgençək yer adıyla bağlıdır. Ürgenç türk-hun tayfalarının birinin adıdır. Özünəməxsus görünüşü, daha çox qıpçaq üzlü olan, sazlı sözlü, dönməz, alt qatları yaradıcılıqla dolu, dastanlar yaradan, dastanlar bilən bir eldi, var olsun. Qayım-qədim olsun, biz köçməyə məcbur olduq, onlar köçməsin... Bir zamanlar gürcü arxeoloqlarının yerli xalqı belə yaxınına buraxmadıqları qazıntılardan daş arabalar çıxmışdı, hələ yazılı gil lövhəciklərdən də söhbət gedirdi...

Beləcə, hər şey yenidən torpağa kömüldü, nə tapdıqlarını da sirr kimi öz içlərinə kömdülər. Kənd o haqda indi də belə deyir: Nə tapmışdılarsa, qorxuya düşmüşdülər...

***

## Yanıltmaclar...

*Tək-tək dükcə, təkcə dükcə, dik-dik dükcə, dikcə dükcə, cüt-cüt dükcə, üç cüt dükcə, cütcə dükcə, üçcə dükcə...*

*Dəyirmana girdi köpək, görək, kəpək yedi, köpdü köpək, kötək yedi, köpdü köpək..*

***

## Bir qarının üç gəlini...

Bir qarının üç gəlini varmış, atam, bu qarı gəlinlərin üçünün də iki əlini bir eləyib oturdubmuş bir küncdə, – dur, deyəndə dururlarmış, otur, deyəndə otururlarmış. Verərmiş yeyərlərmiş, verməzmiş durub baxarlarmış. Qorqud Dədə demiş, "bəbəyi bitməsin, belə qarıların". Keçənnərin sözüdü, günlərin birində Qarını toya çağırırlar, Qarı toya getməli olur... Gəlinlərin üçünü də çağırır yanına: – Mən gedirəm toya, – deyir, – ölməyəcəm ki toyda, qayıdıb gələcəm, mənsiz bir şeyə əl vurarsız, "gününüzü göy əsgiyə düyünləyib ovcunuza qoyaram (hansısa çox-cox qədim mərasimlə bağlıdır, izahı üçün hələlik heç nə deyə bilmərəm).

Qarı toya getməyində olsun, görək gəlinlər neynədi... Evin yuxarı başında dovğa qazanı vardı; yemək-içməyin hamısı o tərəfdə – yuxarı başdaydı. Qarı torpaq döşəməyə o başdan-bu başa su töküb yumşaldıb, manşır qoyub getmişdi. Gəlinlər burdan ora baxıb: – Neyniyək, – deyirdilər, – hancarı addayaq, necə keçək o tərəfə, ayağımızın izi qalmasın. Bir az dovğa içərdik, bir az da unnan-dənnən götürüb kökə bişirərdik. Kiçik gəlin çox bilmiş idi, nə fikirləşdisə, çıxdı eşiyə, bir də gördülər, eşşəyin belində gəlir, keçir içəri, eşşəyi sürür, düz evin yuxarı başına, dovğanın yanına. Dovğadan yeyir, gəlinlər üçün də kökəlik un götürür, qaydır geri. Eşşəyi də aparıb bağlayır yerinə. Kökəni təzəcə bişirib qurtarmışdılar ki, gördülər Qarı gəlir. Əl-ayağa düşdülər. Kiçik gəlin dedi: – Harda gizlətsək tapacaq. Gəlin kökələri ipə keçirək, paltarımızın altından belimizə bağlayaq. Elə də eləyirlər. Qarı içəri keçən kimi gəlinlərin taxımından bildi ki, arada nəsə var, qorxa-qorxa tərpənirlər. Bir az irəli yeriyir, eşşəyin izini görür, amma anlaya bilmir ki, eşşək burda, evin yuxarı başında neyniyə bilər. Ürəyində deyir, "gəlinləri oynadım, bəlkə bir şey öyrənə bildim". Deyir: – Yarımadım sizdən, özgələrdə gəlinlər var, sona kimi süzürlər toylarda. Gəlinlər bir ağızdan dedilər: – Niyə? Bizi də toya aparaydın görərdin necə oynayırıq. Qarı deyir: Nolar, indi oynayın, baxım. Gəlinlər başlayırlar çalıb oynamağa. Böyük gəlin oynayıb oxuya-oxuya deyir:

Eşşəyin izi qara,
Yaş oldu izi qara.
Adın çəkmə, qayım tut,
Açılar, düşər üzü qara.

Ortancıl gəlin  oynaya-oynaya ortaya çıxır:

Kimsə bilməz nə dərddi,
Oyna, deynən mədətdi.
Yüz atdanam, yüz düşəm,
Açılmaz, bağı bərtdi.

Ən çox atdanıb düşən kiçik gəlin idi:

Eləmi qiyamətdi,
Oyna, de, qiymətdi.
Yavaş atdan, yavaş düş,
Açılsa qiyamətdi.

Arada nəsə olduğunu Qarı bayaqdan hiss eləmişdi, amma hələ də bilmirdi arada olan nədi, o da gəlinlərə qarışıb başladı oynaya-oynaya oxumağa:

Meydan sizin, söz sizin,
Başdan-başa süz sizin.
Bircə şeyi annadım,
İz eşşəyin, üz sizin...

***

Bəlkə də tarixçi olmadığıma görə belə düşünürəm... Tarix əslində olmuş hadisələrin qeyd edilməsi və yaxud yazıya alınmasıdır, doğrudur, olmamış hadisələr də yazılıb, adına da tarix deyilib, ona görə mümkündür ki, yazıya alınmış yalançı tarixlərə görə əsl tarix bir daha yaşanmasın. Çünki tarixin yazılmağında "əl olduğu" üçün və bir adam yazdığı üçün arada "barmaq yalanının" olması ehtimalını qəbul etməliyik... Müasir İran alimi Nasir Pur Pirar son illərdə nəşr etdirdiyi və Güntay tərəfindən dilimizə çevrilən "On iki əsr sükut" əsərində yazır ki, Dara Bisutin Qayaüstü yazı lövhəsini sökdürüb öz adını və qələbələrini ora həkk etdirdi...

Gəlin düşünək... Pozulanlarsa Böyük Midiya tarixindən, adlarından, qələbələrindən, uğurlarından başqa nə olmalıydı...

Ermənilər minillər boyu yazmış olduqları tarixi elə min illərdi də axtarırlar, min-min illər də keçsə, tapmayacaqlar, çünki onlar tarixi olduğu kimi yox, yalan yazıblar, öz istədikləri kimi, özlərinə necə lazımdırsa elə yazıblar, tarixə "barmaq" eləyiblər... Tarixsə daha çox keçmişdir, şərəfli, ya şərəfsiz olsa da, yaşanmış keçmişdir, gələcək deyil. Yaxşı ki, belədir... yoxsa, gələcəyi istənilən vaxt dəyişmək mümkün olardı... necə ki, qonşularımız həmişə buna cəhd ediblər.

Bununla belə, çox təəssüf ki, saxta tarixlərlə iş görmək, gələcəyi dəyişmək, yer üzünün təbii quruluşuna saxtalıqlar gətirmək mümkünmüş. Təəssüf ki, yalanlarla, saxta yazılarla da cəmiyyəti inandırmaq, ən azı düşüncələrdə istilalar mövcudmuş. Tarixdə belə faktlar təəssüf ki, çoxdur...

Adını çəkdiyim İran alimi Nasir Pur Pirar özünün "On iki əsr sükut" əsərində tarixin atası sayılan Herodota şübhəylə yanaşır. Deyir ki, Daranın hakimiyyətindən sonra farslar Heredotu müxtəlif yollarla ələ aldılar. Ona görə də Herodot öz "Tarix" əsərində tarixi gerçəklikləri gizlədib farsları, onların hakimiyyətlərini, döyüşlərini, adət-ənənələrini şişirdib tərənnüm etdi.

Halbuki, Midiya kimi azman bir imperatorluq yenicə çökmüşdü... Midiya ordusunun sərkərdəsi Qarpaqın midiya ordusuyla bir yerdə üsyan qaldırmış mehtər farsların – atlara baxanların tərəfinə keçməsiylə Astiyaq məğlub olmuşdu. Tarixdə şah Astiyaqın üsyançılar tərəfinə keçmiş sərkərdəsi üçün dediyi sözlər, doğrudan da bütün dövrlər üçün xarakterikdir. Heredot midiyalılar haqqında çox qısqanclıqla yazsa da, mühüm mətləblərə toxunub... Astiyaq Qarpaqa deyir:

– Sən bir yox, bir neçə dəfə axmaqsan. Birinci, axmaqsan ona görə ki, sən öz oğlunun qisasını tək məndən almalıydın, amma bütün Midiya xalqından aldın. İkinci, axmaqsan ona görə ki, öz xalqını qul elədin, qulları başa çıxartdın. Üçüncü, axmaqsan ona görə ki, özün şah ola biləcəyin halda bir köləni şah etdin, və s...

Midiya özünün **böyüklüyünün və təmizliyinin** qurbanı oldu. Onu hiylə çökdürdü, hiyləylə də hakimiyyətə gəldilər.

Mərkəzdən uzaqlara sürgün edilmiş, oralarda Nineva atlarına baxan farslar elə Midiya ordusunun gücüylə qonşu dövlətləri də Midiyalı sərkərdə Qarpağın başçılığı ilə bir-birinin ardınca məğlub etdi.

Bu mənada doğrudur, klassik yaradıcılığımızda elə bir şey yazılmayıb... Hara baxasan? Nəyə baxasan? Bu haqda lazımım ola biləcək elə bir şey yoxdur... *Çox şükür ki, xalq var, öz yaratdıqları üstündə bərqərardı, sağlamdı, yenə də yaratmağındadı.*

***(davamı növbəti sayımızda)***

# MÜNDƏRİCAT

